# Müqəddimə

Aramızdakı ixtilaflı mövzuları bir kənara buraxıb ittifaq etməyə ən çox ehtiyac hiss etdiyimiz bir vaxtda, ayrılıqlara dair bir şeylər yazılmasını qəribsəyici kimsələr ola bilər.

Ancaq əziz oxuyucu, ixtilaf mövzusundakı sözümüzün, mövcud görüşlərdən birini dəstəkləyib digərini tərk etmək ya da bir məzhəbi digərinə tərcih etmək şəklindəki ixtilaflara dair olmadığını gördüyündə, bu qənaətin sürətlə ortadan qalxacaqdır.

Bizim burda edəcəyimiz araşdırma, mövcud fiqhi ixtilafların həqiqətini vüzuha qovuşdurmaq, qaynağını, səbəblərini və hökmünü bəyana ətf edilmiş olacaqdır ki, insanların, ixtilafları tərk etməsinə kömək olacaq, ayrılıqları kökündən yox edəcək, inşə Allah daha kamil bir yardımlaşmağa və daha geniş bir ittifaqa götürəcək faktorlardandır.

Bunun belə olduğunu mən, Riyadda imam Muhammməd b. Suud İslam Universiteti Şəriət fakultəsində Əhkam hədisləri dərsləri verdiyim illərdə felən müşahidə etdim. İxtilafın təbiəti və səbəbləri haqqındakı bu anlayışın, tələbələrin elmi və əməli həyatlarına etdiyi təsiri şəxsən izləmək imkanı tapdım. Bu da məni mövzunun arxasına düşməyə və bu baxış tərzini mümkün olduğu qədər yaymaq üçün səy göstərməyə sövq etdi...

Xalqın yaşayışını izləyən, problemlərini və ixtilaflarını incələyən kimsə, anlaşmazlıqların bir çoxunun, insanların bir birini düz başa düşməməsindən və ya bir biriləri haqqındakı su-i zəndən qaynaqlandığını görər. Bu hal, münasibətlərdə ixtilafın hakim olmasına səbəbiyyət verər; beləcə tərəflər arasındakı məsafə get-gedə açılar.

Ancaq tərəflərin bir araya gəlib bir birilərinin baxış tərzini

başa düşməsi, bir birilərinin hüsn-ü zənninə və yaxşı niyyətinə qənaət gətirməsi halında, aralarındakı divarlar sarsılar, hətta tamamilə ortadan qalxacaq mərhələyə gələr. Beləcə tərəflər, hiç bir qeyri-müəyyənliyin bulandıra bilməyəcəyi bir ittifaq və müvafiqlik zəmininə qovuşar.

Praktiki həyatdan aldığımız bu nümunə, fiqhi məzhəblərin və elmi görüşlərin həqiqəti mövzusunda, fərqli qruplar arasında zaman-zaman ortaya çıxan anlaşmazlıqların mahiyyəti mövzusunda açıqlayıcı ola bilər. Bu kontekstdə, tərəflər bir birilərini amansız düşmən olaraq görür və bir birilərilə döyüşür, bir birilərinə üstünlük qazanmaq üçün dayanmadan səy göstərirlər.

Hətta bəziləri, fiqhi məzhəblərə, «uğursuz ayrılmalar» olaraq baxır. Hadisəyə belə baxanlar, 4 məzhəbi, -birinin varlığı, o birinə maneə imiş kimi- bir birini yox etməyə və ortadan qaldırmağa əzm etmiş «4 düşmən» olaraq təsəvvür edir. Onlar məsələyə belə baxarlarkən, bir yandan məzhəblərdən birinə intisab və məzhəbinə təəssüblə sarılmaq xaricində məzhəblərin həqiqəti mövzusunda bir şey bilməyən bəzi kimsələrin cahilcə davranışlarına, digər yandan alimlərin, elmi münaqişə və münazirələrdə bir birinə qarşı görüşləri təsvir məqsədilə, muxatabları haqqında istifadə etdikləri «müxalif» təbirinə dayanırlar. Bir qisim elmi məfhumlar, xalq üzərində yalnış effektlər meydana gətirə bilir...

Bu səbəblə, bu risalədə bəhs mövzusu fiqhi ixtilafın həqiqətini, qaynağını və səbəblərini ortaya qoymağı və hökmünü açıqlamağı arzu etdim. Bu sayədə, müsəlman, bu məsələ haqqındakı davranışını doğru olaraq müəyyənləşdirmək, dini mövzusunda bəsirət üzərə hərəkət etmək və ifrat və təfritə düşməkdən çəkinmək imkanına qovuşmuş olacaqdır.

Müsəlmanın ifrat və təfrit yalnışına düşməsi demək, düşmənə,

içəri sızaraq dini və əqidəni ifsad edəcəyi bir dəlik açması deməkdir. İslam binasını müsəlmanların idrakında, şüurunda yıxmaq yolunda səy göstərmək, keçmişdə olduğu kimi, bu gün də İslam düşmənlərinin adət halına gətirdikləri bir davranışdır. Onların bu məqsədlə tətbiq etdikləri incə və gizli metodlardan biri, müsəlmanları fiqh və fəqihlər mövzusunda şübhəyə düşürtməkdir. Bir qisim cahil və bəsit kimsələrə təsir edərək, ixtilaflı fiqhi mövzuları məzhəb müntəsibləri arasında gündəmə gətirər, beləcə bir yandan onları daha əhəmiyyətli məsələlərlə məşğul olmaqdan uzaq tutar, digər yandan da, Müsəlmanların fiqhlərinə və fəqihlərinə olan güvəncini sarsmış olurlar. Bütün bunlar, Müsəlmanları, dinlərinin və məzhəblərinin əhkamından sıyırıb, həva və şəxsi görüş toruna düşürən davranışlardır.

Keçmişdə böyük imamlar, düşmənlərin bu metodlarına diqqət çəkmiş, onların üzündəki maskaları endirmiş, girdikləri hiləli yollarda onları təqib etməyi buraxmamışlardır.

Alimlər, fəqihlər arasındakı ixtilafların həqiqətini açıqlayan böyük-kiçik həcmli əsərlər yazmış, üsuldakı ixtilaflarla fürudakı ixtilafları bir birindən ayırmış, xalqa pis niyyətlər və çirkin əməllər mövzusunda xəbərdarlıqlar etmişlərdir.

Bu cümlədən olaraq, imam ibn Teymiyyə, bəzi ixtilaflı fiqhi məsələləri açıqladıqdan sonra, bu xəbərdarlığı edir:

«Bu tərz bir zəif məsələni[1] , tənqid etmək məqsədilə olsun, tərəf durmaq məqsədilə olsun, Müsəlmanların imamlarından hər hansı birisinə nisbət etmək caiz deyildir. Çünki belə bir nisbətdə imamlara bir növ tən etmək və zəif qövllərə tabe olmaq vardır..

Tatarların vəziri[2] bu surətlə, əhl-i sünnət məzhəbləri arasına

---

1 Burdakı «zəif məsələ»dən məqsəd, dəlili və və ya istinbat tərzi zəif olan məsələdir.

2 Qəsd edilən kəs, İslam torpaqlarını istilaları əsnasında, Monqollara

fitnə salmış, onları Sünnət və Camaata qarşı çıxmağa, Rafizi və digər haqq yoldan sapmış məzhəblərə girməyə dəvət etmişdir...» [1]

Bu risalənin sonunda inşəAllah, alimlərin əvvəldən bəri fiqhi ixtilaflar mövzusunda qələmə aldıqları əsərlərin zikrinə dair xüsusi bir bölməyə yer verəcəm.

Allah Taala'dan qəlbimizə hidayət verməsini, dinimizin həqiqətini bizə idrak etdirməsini, nəfslərimizin zəif nöqtələrini göstərməsini -beləcə düşmənlərimizin tələlərindən səlim qalmaq imkanı əldə etməyi- diləyirik.

O nə gözəl Mövla, nə gözəl köməkçidir!

Vəlhəmdu lilləhi Rabbi'l-Aləmin.

Əbu'l-Fəth əl-Bəyanuni, Riyad, 1395/1975

---

dəstək verən və onlar tərəfindən -vəzirlik məqamına gətirilmək də daxil olmaq üzərə- fərqli şəkillərdə təltif edilən şiə filosof, Nəsrəddin Tusi olsa gərəkdir[*] (bax: ibn Teymiyyə, «Məcmuu'l-Fətava», XXXV, 152)

*1 İbn Teymiyyə, «Məcmuu'l-Fətava», XXXll, 137, Abdurrahman b. Muhamməd b. Qasım əl-Asimi cəm və tərtibilə, tarix yoxdur*

## 1. Fiqhi ixtilafların həqiqəti:

Elmi ixtilaflar və fiqhi görüşlər/ictihadlar, bəzi kimsələr tərəfindən, Allah Taala'nın dinində irəli sürülmüş «şəxsi görüşlər» olaraq dəyərləndirilir. İctihadların birdən çox olması və bir biri ilə ixtilaflı olması, onlara görə, bu səbəbdəndir.

Hətta bəzi kimsələr, fiqhi ixtilafları, Kitab və sünnətə alternativ olaraq ortaya çıxarılmış, dolayısı ilə, müsəlman tərəfindən «divara çırpılması», uzaq durulması, tərk edilib Allahın Kitabına və Rəsulunun sünnətinə rücu edilməsi (geri dönülməsi) gərəkli olan «yeni bir din» olaraq təsəvvür edirlər.

Təəssüb sahibi bəzi kimsələrin, bəhs mövzusu görüşlərə/ictihadlara, olduğundan artıq dəyər verməsi, onlara sarılıb digərlərini rədd etməsi şəklində təzahür edən davranışları da, bu xətalı düşüncənin insanlarda yer etməsinə köməkçi olmaqdadır. Məsələnin bir yönü də budur.

Digər yönü də, mütəaxxirun (sonra gələn) alimlərin bir çoxunun, fiqhi görüşləri/ictihadları, ixtisar məqsədilə əsərlərində dəlilsiz bir şəkildə zikr etmələridir.

Bu hal, fiqh kitablarını yaxından tanımaq imkanı tapa bilməmiş bəzi kimsələrin, o görüşləri/ictihadları, şər'i təməlləri olmayan mücərrəd «şəxsi görüşlər» olaraq dərk etməsinə, anlamasına yol açmaqdadır.

Bununla birlikdə, diqqətli və şüurlu bir gözlə baxanlar, o görüşlərin/ictihadların Kitab və sünnət əhkamının (hökmlərinin) bəyanı olduğunu görər. Necə ki, imamlar, dəlilləri toplamaq və bir-birindən ayırmaq yönündə, var güclərini sərf etdikdən və bütün səylərini o nöqtəyə yönəltikdən sonra, bəhs mövzusu hökmləri, şəri dəlillərdən çıxararaq ortaya qoymuşlardır.

Bu cəhətdən, bəhs mövzusu görüşlər/ictihadlar, -bəzilərinin zənn etdiyi kimi, bir çox fərqli ağacda yetişən fərqli meyvələr

deyil- bir tək ağacda, Kitab və sünnət ağacında yetişən fərqli meyvələr məsabəsindədir.

- Ağacın gövdəsi- Kitab və Sünnət;
- Budaqları- Fərqli şəri və əqli dəlillər;
- Meyvələri isə- bütün ixtilaf və fərqləri ilə, fiqhi hökmlərdir.

Dinlərində, Rəblərinin Kitabından və Nəbilərinin Sünnətindən, imamları tərəfindən çıxarılmış hökmlərə tabe olan avam ilə;

Dinlərində rahiblərinin -Allah Taalanın əmrinə zidd- nəfsi görüşlərinə tabe olan Kitab əhli arasında bu nöqtədə böyük bir fərq vardır.

Allah Taala, imamlarının istinbat etdiyi hökmlərə tabe olanlara xitabən:

«Bilmirsəniz, zikr əhlindən soruşun.» (Nəhl/43) diyə əmr etmişkən;

Digərlərinin halını:

*«Allahı qoyub baş keşişlərini və rahiblərini rəbblər qəbul etdilər.»* **(Tövbə/31)** buyuraraq ifşa etmişdir.

Necə ki, Allah rəsulu (sallallahu aleyhi və səlləm), Adiyy b. Xatəm ət-Tai hüzuruna girdiyində, bu ayəti oxumuşdu. Adiyy deyir ki:

«Onlar, bunlara qulluq etmirlər!» dedim. Allah rəsulu (sallallahu aleyhi və səlləm):

«Bəli, edirlər. Baş keşişləri və rahibləri, onlara halalı haram, haramı halal qılır; onlar da bunlara tabe olurlar. Bax bu, onların bunlara qulluq etməsidir.» buyurdu[1].

---

1 İbn *Kəsir, «Təfsir-u Qurani'l-Azim», II, 348, Daru'l-Marifə, Beyrut, 1402/1982, I-IV; əbu Hayyan, «əl-Bahru'l-Muhit», V, 32*

Bu səbəblə alimlər, ictihadı:

«Şəri hökmləri, şəri dəlillərdən çıxarmaq üçün, bütün gücünü sərf etməkdir.» deyə tərif etmişlərdir.

Bununla bərabər, ictihad üçün incə bir çox şərtlər də ön görmüşlərdir ki, əhil kimsələrdən başqası, bu qapıdan girməsin. Bəhs mövzusu şərtlər, üsul kitablarında təfsilatlı olaraq zikr edilmişdir.

Sələfdən və xələfdən bu ümmətin əksəriyyəti, fiqhi ixtilafların həqiqətini anlamış və ixtilafların səbəblərini izah və həqiqətini bəyan edən, ixtilaf etdikləri əhkam mövzusunda imamların qınanmaması gərəkdiyini ortaya qoyan, çoxlu kitablar yazmışlardır.

Bu söylədiklərimizin doğruluğunu isbata, tabiun zamanında Mədinə'nin alim və fəqihi olan- imam əl-Qasım b. Muhamməd'in bu sözü kifayət edər:

«Allah Taala, Allah rəsulu (sallallahu aleyhi və səlləm)'in səhabələrini, əməllərində ixtilaf etməklə mənfəətləndirmişdir. Onlardan hər biri, etdiyi əməldə genişlik mövcud olduğunu və özlərindən daha xeyirli olanın (Allah rəsulunun) da o şəkildə əməl etdiyini bilirdi.» [1]

Ömər b. Əbdü'l-Əziz (radiyallahu anh)'ın bu sözü də eyni istiqamətdədir:

«Allah rəsulu (sallallahu aleyhi və səlləm)'in səhabələri ixtilaf etməmiş olsaydılar, bu, mənə xoş olmazdı. Çünki bir tək görüşlə əməl etmə məcburiyyəti olsaydı, insanlar çətinliyə düşərdilər. Bir kimsə onlardan birinin görüşü ilə əməl edəcək olarsa, özü üçün genişlik olar.»[2]

---

1 *İbni Abdi'l-Bərr, «Cami'u bəyani'l-İlm və fadlih və mə yənbəği fi rivayətihi və hamlih», II, 78,92, (əbu'l-Əşbal əz-Zuheyri təhqiqi ilə), Dar'u ibnu'l-Cevzi, Riyad, 1414/1994, I-II*

2 *Xatib əl-Bağdadi, «əl-Fəqih və'l-Mutəfəqqih», II, 59-60*

Allamə Şah Vəliyullah əd-Dihləvi (rahmətullahi aleyh), fiqhi ixtilafların təbiətini açıqlayarkən, belə deyir:

«Fəqihlər arasında cərəyan edən ixtilaflar, xüsusilə də Səhabələrin görüş bəyan etdiyi xüsuslar çoxluqla ikili olur.

- Təşriq təkbirləri,
- Bayram namazlarındakı təkbirlər,
- Ehramlının nigahı,
- ibn Abbas və ibn Məsud'un təşəhhüdləri,
- İmamın açıqdan oxuduğu namazlarda bismillahın və «amin» ləfzinin gizli söylənməsi,
- Qamət cümlələrinin iki dəfə və ya tək-tək söylənməsi... kimi.

Fiqhi ixtilaf, (bu və bənzəri məsələlərdə) 2 görüşdən birini almaqdan ibarətdir.

Sələf, bütün bu xüsuslarda mövcud qövllərin hər hansı biri ilə əməlin məşru olmasında deyil, 2 seçimdən əvla olanın tərcihi xüsusunda ixtilaf etmişdir. Qurra'nın (qiraət imamlarının) Quran qiraətlərindəki ixtilafı da buna bənzəyir.

Alimlər ixtilafın səbəbi üzərində durarlarkən, çox dəfə səhabənin ixtilafına ətflər edər və onların hamısının da hidayət üzərə olduqlarını da vurğulayarlar. [1]

Bu səbəblə alimlər əvvəldən bəri, ictihadi məsələlərdə müftilərin (fərqli məzhəblərin ictihadlarına görə verilən) fətvalarını və qazıların (yenə bu tərzdəki) qəzalarını caiz görmüş, kimi zaman məzhəblərinə zidd hökmlərlə əməl etmişdir...» [2]

---

1 *Səhabənin ixtilafına dair təfsilatlı məlumat üçün bax: əbu Səri Muhamməd Abdulhadi, «İxtilafu's-Sahabə əsbabuhu və əsaruhu fi fiqhi'l-İslami*

2 *Şah Vəliyullah əd-Dihləvi, «əl-İnsaf fi bəyani əsbabi'l-Xilaf», 108,* (Ab-

İləridə gələcək olan «Fiqhi ixtilafların hökmü və alimlərin bu xüsusdakı davranışı» başlığı altında bu həqiqət üzərində daha çox izah və bəyanla durmaq imkanımız olacaq.

## 2. Fiqhi ixtilafların qaynağı:

Fiqhi hökmlərdəki ixtilaf, Peyğəmbər (sallallahu aleyhi və səlləm) zamanında yavaş-yavaş ortaya çıxmağa başlayan «əhkamda ictihad» faktından qaynaqlanmaqdadır. O vaxtda ictihadın çox yayılmış olmaması, Allah rəsulu (sallallahu aleyhi və səlləm)'ə enməkdə olan vəhyin, insanları ictihaddan zəngin qılması idi.

Allah rəsulu (sallallahu aleyhi və səlləm) vəfat etdikdən sonra Səhabələrin (Allah hamısından razı olsun) fərqli mərkəzlərə dağılmaları ilə, ictihad dairəsi də genişləməyə başladı.

Vəhyin kəsilməsi və səhabələrin fərqli yerlərə yayılmaları ilə, şəri hökmlərdə ixtilaf çərçivəsinin genişlənməsi, təbii haldır. Çünki fiqhi ixtilaf faktı, 2 əsasa dayanır:

1. Şəri nassların fərqli anlaşılmağa ehtimallı quruluşu;

2. Anlayış və dəyərləndirmə tərzlərinin fərqliliyi.

Allah Taalanın şəri məsələlərdə hikməti, Quran və sünnət nasslarının çoxunun birdən artıq şəkildə anlaşılmağa ehtimallı olmasını gərəkdirmişdir. Quran, açıq ərəb dili ilə enmişdir və ərəb dilində ləfzlərin ehtimallı strukturu, hər kəs tərəfindən bilinən və iqrar edilən bir xüsusdur ki, ərəb dili, bu quruluşu ilə, digər dillərdən ayrılır.

Eynilə bunun kimi Allah Taala'nın yaratmasındakı hikmət də, insanların ağıl və idrak baxımından fərqli-fərqli olmasını gərəkdirmişdir. Bu sayədə, varlıq kamillik qazanır, insanların <u>elm və ağıl cəhətdən bir birilərindən ayrılması və</u> yarışması

dulfəttah əbu Ğuddə təliqi ilə), Daru'n-nəfais, Beyrut, 1403/1983

mümkün olur.

Ağıl sahibi olan heç kim, bu 2 əsas həqiqətin qaçılmaz olaraq görüş və hökmdə ixtilafa yol açacağından və bunun qəti və açıq bir nəticə olaraq ortaya çıxacağından şübhə etməz.

İndi bu açıq riyazi tənliyə baxaq:

1. Ehtimallı nasslar + Fərqli anlayış tərzləri = İxtilaf

2. Qəti nasslar + Bir tək anlayış tərzi = Tək görüş

Məzhəb və görüşləri birləşdirməyə çalışmaq fikri, möhtəmələn bu 2 əsas və bu 2 açıq həqiqətdən qafil olma halının doğurduğu bir nəticədir.

Görünüşdə -nəfslərə xoş gələn- «vəhdət/birlik» və «tək görüş ətrafında birləşmə və ittifaq» adına hərəkət edilir olması da, bu fikrin, bəzi qruplar tərəfindən mənimsənməsini mümkün qılmaqdadır.

Allah Taala'nın məxluqatda cari qıldığı hikməti, bu insanlar görə bilmirlər. Allah Taala istəsəydi, bütün insanları, düşüncə və anlayışda bir tək ümmət qılar, Kitabı da icmal və ehtimala yer verməyən (bütünü ilə) mübəyyən (bəyan edilmiş) və müfəssər (təfsir edilmiş, açıqlanmış) bir tərzdə endirərdi!

Allah Taala, qullarının Özünə ibadət etdiyi bu dinin hökmləri mövzusunda, anlayış və görüşləri birləşdirməyi diləsə, bir yandan şəri nasların birdən çox məna verən ehtimallı quruluşunu dəyişdirər, digər tərəfdən də tək hökm üzərə ittifaq etsinlər diyə, insanların anlayış tərzlərini təkə endirərdi.

Misal olaraq, Bəqərə surəsindəki bu ayəti ələ alaq:

«Boşanmış qadınlar, 3 «qur» gözləyərlər.» (Bəqərə/228)

Buna qarşılıq, eyni surədə, bu ayətdən iki ayət əvvəl:

«Qadınları ilə yaxınlıq etməməyi and içənlər üçün gözləmə

müddəti 4 aydır.» (Bəqərə/226)

Allah Taala ilk ayətdə 3 «qur» buyurduğu halda, ikinci ayətdə, «4 ay» buyurmuşdur.

Yenə ilk ayətdə gözləmə müddəti «üç»lü rəqəmlə, ikinci ayətdə isə, «dörd»lü rəqəmlə ifadə edilmişdir. Bu rəqəmlər qəti olub bilinən rəqəmlərdir və birdən artıq məna verməzlər.

Bu halı, ilk ayətdə keçən «3 qur» ilə ikinci ayətdə keçən «4 ay» ifadəsinin meydana gətirdiyi mənzərə ilə qarşılaşdırdığımızda, bunu görürük:

İlk ayətdəki «qur» kəliməsi, ərəb dilində birdən çox mənaya gəlməkdədir. Buna qarşılıq, ikinci ayətdə keçən «ay» kəliməsi qətidir, birdən artıq məna ifadə etməz.

Əbu Amr b. əl-Ala (7 qiraət imamından biri) belə deyir:

«Bəzi ərəb qəbilələri, heyz müddətinə «qur» deyərkən, bəziləri də bu kəliməni 2 heyz arasındakı təmizlik müddətini ifadə etmək üçün istifadə edirlər. Bir qisim həm heyz, həm də təmizlik müddətinə (birlikdə) ‘qur’ deyirlər.»[1]

Əbu Bəkr Əhməd b. Əli ər-Razi əl-Cəssas isə, belə deyir:

«Sələfin ittifaqı səbəbilə, «aqra» kəliməsinin 2 xüsusu, «heyz» və «təmizlik» vaxtlarını bildirmək üzərə istifadə edilməsi nəticəsi hasil olmuşdur.

Bu məsələnin 2 yönü vardır:

1. Bu kəlimə, birdən artıq mənaya ehtimallı olmasa idi, Sələf onu 2 mənaya gələcək şəkildə təvil etməzdi. Onlar lüğətə, isimlərin mənalarına və ibarələrdən əldə edilən mənalara vaqif idilər. Onlardan bir qisminin bu kəliməni «heyz», bir qisminin «təmizlik» olaraq təvil etmiş olmasından dolayı başa düşürük ki, bu kəlimə, hər 2 halı bildirmək üzərə də istifadə edilə bilər.

---

1 *İmam Qurubi, «əl-Cami li ahkami’l-Quran», lll, 133,*

2. Bu, onlar arasında yayılmış və bilinən bir ixtilaf idi və onlardan heç biri, bu xüsusda, digər görüşü mənimsəmiş olan müxalifini hər hansı bir şəkildə qınamamışdı. Tam əksinə, tərəflərdən hər biri, müxalifinin müxalif görüş mənimsəməsini, normal qarşılamışdı.

Bax bu hal, bəhs mövzusu kəlimənin, 2 mənaya da ehtimallı və məsələnin ictihadi olduğunu göstərir...»[1]

İndi, Bəqərə surəsinin 228-ci ayətində keçən 3 «qur» ifadəsinin anlaşılmasında görüşlərin fərqliləşməsi və eyni surənin 226-cı ayətində keçən '4 ay' ifadəsinin anlaşılmasında ittifaq edilməsi, təbii deyil midir?

Bu xüsusda imam Qurtubi bunları deyir:

«Alimlər, 'aqra' (qur kəliməsinin cəm halı) kəliməsinin mənasında ixtilaf etmişlərdir.

Kufəlilər:

'O, heyzdir.' demişlərdir, ki:

Ömər, Əli, ibn Məsud, əbu Musa, Mücahid, Qatadə, əd-Dahhaq, İkrimə və Süddi'nin görüşü də bu yöndədir.'

Hicazlılar isə:

'O, təmizlik müddətidir.' demişlərdir. Bu da: Aişə, ibn Ömər, Zeyd b. Sabit, Zühri, Əban b. Osman və Şafi'nin mənimsədiyi görüşdür.'[2]

Əgər Allah Taala, bu məsələdə görüşlərin birləşməsini murad etsə idi, 226-cı ayətdə «4 ay» buyurduğu kimi, 228-ci ayətdə də «4 heyz müddəti» və ya «4 təmizlik müddəti» buyurardı! Birdən çox mənaya gələn bütün şəri nasslar, buna qiyas edilə bilər...

1 *əl-Cəssas, «Əhkamu'l-Quran», I, 430, (Muhamməd əs-Sadiq Qamhavi təhqiqi ilə), Daru İhyai't-Turasi'l-Arabi, Beyrut, 1405/1985, I-V*

2 *Qurtubi, III, 113*

Allah Taala’nın belə murad etmiş olmasındakı hikməti təyid edən (qüvvətləndirən, dəstəkləyən) xüsuslardan biri də, şəri naslardan çoxunun dəlalətinin zənni olmasıdır.

Allah Taala, bununla sanki bir yandan görüşlərin və anlayışların şaxələnməsi ilə insanlara asanlıq diləmiş, digər yandan da, ağılların önündə geniş bir sahə açmışdır ki, insanlar Kəlamullahdan və Peyğəmbərin (sallallahu aleyhi və səlləm) sözlərindən istinbat etsinlər və çıxarılan hökmlərlə (fərqli tərzlərdə) əməl etsinlər.

Mühəqqiq (həqiqətləri incələyən və dəlilləri ilə bilən) alimlər, müxtəlif kontekstlərdə, bu hikmətlərə işarət etmişlərdir. İmam Zərkəşi’nin aşağıdakı sözləri bu qəbildəndir:

«Bil ki, Allah Taala, bütün şəri hökmlər üçün qəti dəlillər təyin buyurmuş deyildir. Əksinə, şəri dəlilləri(n bir qismini) qəsdən zənni qılmışdır ki, mükəlləflərə genişlik olsun. Beləcə mükəlləflər, dəlilin qəti olması səbəbilə bir tək məzhəbə bağlı olmaq kimi bir hala bağlı qalmamışlardır...» [1]

Fiqhi hökmlərdəki ixtilafların ilk ortaya çıxışının Peyğəmbər (sallallahu aleyhi və səlləm) zamanında olsun, Ondan sonra olsun, Səhabə (Allah hamısından razı olsun) əsrinə qədər getdiyini qüvvətləndirən bir neçə misal zikr edək:

## 2.1 Səhabənin, Bənu Qurəyza’ya gedərkən yolda vaxtı girən namazı qılmanın hökmü mövzusundakı ixtilafı:

İmam əl-Buxari, Səhih’ində ibn Ömər (radiyallahu anh)’ın belə dediyini rəvayət edir:

1 *İmam Mahlavi, «Təshilu’l-Vusul ilə ilmu’l-Usul», 240, Qahirə, 1341/1922*

«Əhzab günü[1] (Bənu Qureyza üzərinə göndərdiyi əskəri birliyə xitabən) Allah rəsulu (sallallahu aleyhi və səlləm):

'Bənu Qureyza'ya varmadıqca, qəti olaraq, kimsə əsr namazını qılmasın.' buyurdu. Yolda gedərkən əsr namazının vaxtı girdi. Onlardan bir qismi:

'Bənu Qureyza'ya çatmadıqca qılmayaq.' dedi. Digərləri isə:

'Əksinə, namazı indi qılaq. Peyğəmbər (sallallahu aleyhi və səlləm)'in bizdən istədiyi bu deyildi (sürətli hərəkət etməyimiz üçün elə dedi.) dedilər.

Bu hal, Özünə zikr edildiyində isə, Peyğəmbər (sallallahu aleyhi və səlləm), onlardan heç kimi qınamadı.»[2] Bu misalın təfsilatı irəlidə, ixtilaf səbəblərinin ikincisində zikr ediləcəkdir.

## 2.2 Əbu Səid əl-Xudri (radiyallahu anh) belə rəvayət etmişdir:

«(Səhabədən) 2 nəfər bir səfərə çıxmışdılar. Yolda namaz vaxtı girdi; ancaq yanlarında su yox idi. Bunun üzərinə təmiz torpaqla təyəmmüm edərək namaz qıldılar. Bir müddət sonra -hələ vaxtı çıxmamışkən- su tapdılar. Onlardan biri dəstəmaz

---

1 Əhzab günü təbiri, hicrətin 5-ci ilində baş verən Xəndək döyüşü müddətindən bəhs edir. Qatafan və Qureyş, özlərinə dəstək verən başqa qəbilələrin də qatılması ilə Mədinəyə bir ordu halında hücum etdiyi üçün «əhzab» (hizblər, qruplar) adı ilə də xatırlanır. Bu döyüşdə Bənu Qureyza, Allah rəsulu (sallallahu aleyhi və səlləm)'lə andlaşmanı pozub müşriklərə kömək etmişdi. Bunun üzərinə Peyğəmbər (sallallahu aleyhi və səlləm), Xəndək döyüşünün ardından, ara vermədən Bənu Qureyza üzərinə bir ordu göndərdi. (bax: ibn Hişam, «əs-Sirətu'n-Nəbəviyyə», lll, 214 və davamı, (Mustafa əs-Səqqa, İbrahim əl-Əbyari, Abdulhafiz Şələbi təhqiqi ilə), Muəssəsətu't-Tarixi'l-Arabi, Beyrut, 1413/1993, I-IV)

2 *Buxari və Muslim rəvayət etmişdir. bax: ibn Həcər Asqalani, «Fəthul-Bari», Vlll, 411, əl-Matbaatu's-Sələfiyyə.*

alıb o namazı yenidən qıldı. Digəri isə, namazı yenidən qılmadı. Daha sonra Peyğəmbər (sallallahu aleyhi və səlləm)'ə gələrək bu halı xəbər verdilər. Peyğəmbər (sallallahu aleyhi və səlləm), namazı təkrar qılmayana:

«Sünnətə isabət etdin. (Təyəmmümlə qıldığın) namaz, sənə kifayət edər. buyurdu. Dəstəmaz alıb namazı yenidən qılana xitabən isə:

«Sənə iki dəfə savab var.» buyurdu.

Əbu Davud, Sünən'ində: «Təharət/128»də; və Nəsai, Sünən'ində: «Heyz»/28»də rəvayət etmişlərdir.

Bu 2 hadisə Peyğəmbər (sallallahu aleyhi və səlləm) zamanında baş vermişdir. Səhabənin, Allah rəsulu (sallallahu aleyhi və səlləm)'in vəfatından sonrakı ictihadi ixtilaflarına gəlincə, müctəhid imamlar arasında ixtilaflı olan məsələlərin demək olar ki, hamısı, Səhabə zamanındakı ixtilaflara dayanır.

Mövzu ilə bağlı məşhur əsərlərə kiçik bir müraciət belə, fiqhi məsələlərdəki ixtilafların Səhabə zamanında yayılmış olduğu həqiqətini təyid (dəstəkləmək, qüvvətləndirmək) üçün kifayət edəcəkdir.

Peyğəmbər (sallallahu aleyhi və səlləm)'in vəfatından sonra Səhabə arasında ilk ixtilaf, möhtəmələn imamətə kimin daha layiq olduğu, ümmətindən Allah rəsulu (sallallahu aleyhi və səlləm)'ə kimin xəlifə olacağı mövzusunda cərəyan etmişdir. Bundan sonra təfsili hökmlərdə ümumi və xüsusi səbəblərə bağlı olaraq ixtilaflar davam edib gəlmişdir. Bu mövzunu xüsusi bir başlıq altında ələ alacağıq.

Səhabənin ixtilaf etdiyi məsələlərə misal olaraq bunları zikr edə bilərik:

## 2.3 Babanın mirası:

İbn Abbas (radiyallahu anh), babanın da eynilə ata kimi miras buraxan şəxsin qardaşlarını -buradakı «qardaşlıq» hansı surətdə olursa olsun, fərq etməz- mirasda mütləq surətdə, həcb edəcəyi (yəni baba həyatda ikən, qardaşlara miras düşməyəcəyi) görüşünü mənimsəmişdir. Bu görüşündə O, Quranda «ata» kəliməsinin «baba» haqqında istifadə edilə bilməsinə dayanmışdır.[1]

Buna qarşılıq, Ömər, Əli, Zeyd b. Sabit (Allah hamısından razı olsun) kimi digər səhabələr, eyni baxış tərzinə sahib olmuş və (ana-ata bir) olsun, ögey (ata bir) olsun, bütün qardaşların mirasda ataya ortaq olacağını söyləmişlərdir. Çünki bu qardaşlardan hər biri, ata vasitəsilə ölən şəxsə bağlanmaqdadırlar.[2]

## 2.4. Boşanmış qadının, iddət müddətinin nə qədər olduğu mövzusunda da, Səhabə arasında ixtilaf vaqe olmuşdur.

---

1 *Qəsd edilən:
«Ey Adəm oğulları! Şeytan, atanızla ananızı (Adəmlə Həvvanı) ayıb yerlərini özlərinə göstərmək məqsədilə aldadaraq libaslarını soyundurub Cənnətdən çıxartdığı kimi, sizi də aldatmasın.» (Əraf/27)

2 Babanın varlığının eynilə ata kimi ölənin qardaşlarının mirasdan pay almasına əngəl təşkil etdiyi görüşü, sadəcə ibn Abbas (radiyallahu anh)'a məxsus deyildir:
Əbu Bəkr, Aişə, Muaz b. Cəbəl, Ubeyy b. Ka'b, əbu'd-Dərda, əbu Hureyrə, Abdullah b. Zubeyr və əbu Musa əl-Əşari'nin (Allah hamısından razı olsun) görüşləri də belədir.

Ömər, Əli, ibn Məs'ud və Zeyd b. Sabit (Allah hamısından azı olsun),babanın varlığının, qardaşların mirasdan pay almasına maneə təşkil etmədiyini söyləyən səhabələr arasındadırlar. (bax: ibn Abdi'l-Bərr, «əl-İstizkaru'l-Cami li məzahibi fuqahai'l-Rəy və'l-Asar və şərhi zəlikə kullihi bi'l-icaz və'l-ixtisar», XV, 429 və davamı, (Abdu'l-Muti Əmin Qalaci təshih və təhqiqi ilə), Muəssəsətu'r-Risalə, Qahirə, 1414/1993, I-XXX)

• İbn Məs'ud (radiyallahu anh), qadının, üçüncü heyzinin bitməsilə qüsl edib təmizlənmədikcə, iddətindən çıxmış olmayacağını söyləyərkən;

• Zeyd b. Sabit (radiyallahu anh) və digərləri, üçüncü heyz dövrünün başlaması ilə, qadının iddətinin bitəcəyi görüşünü mənimsəmişdir.

Bu ixtilaf, (yuxarıda keçən) «qur» kəliməsinin mənasındakı ixtilafdan qaynaqlanmaqdadır.

## 2.5. Əri ölən hamilə qadının iddətinin nə zaman bitəcəyi mövzusundakı ixtilaf da belədir:

Ömər və ibn Məs'ud (radiyallahu anhuma), bu haldakı qadının iddətinin, doğumla birlikdə bitəcəyini söyləyərkən,

Əli və ibn Abbas (radiyallahu anhuma), 2 müddətdən ən uzun olanın bitməsilə, iddətin sonlanacağı görüşünü mənimsəmişlərdir[1].

Fiqhi ixtilaflardan bəhs edən kitablarda, mövzu ilə bağlı daha çox misallar mövcuddur...

Səhabə (Allah hamısından razı olsun) zamanında əhkam (hökmlər) sahəsindəki ixtilaflar bu şəkildə davam etmiş, Tabiin zamanına qədər gəlmişdir. Tabiin və Ətbau't-Tabiin zamanına gəlindiyində isə, ixtilaf çərçivəsinin daha da genişləndiyini görürük. Bu genişlənmənin bir səbəbi:

---

1 Burdakı «2 müddət»dən məqsəd, «doğuş» və -əri ölən qadının iddəti-ni təyin edən Bəqərə/234 ayətində bildirilən- «4 ay 10 gün»dür.Dolayısı ilə, Əli və ibn Abbas (radiyallahu anhuma)'ya görə, əri ölmüş olan hamilə qadın, 4 ay 10 gündən daha əvvəl doğarsa, 4 ay 10 günün bitməsini gözləyəcəkdir. Doğumun 4 ay 10 gündən daha sonra olmasında isə, doğumla birlikdə iddət də bitəcəkdir.

Daha əvvəl bənzərinə rastlanmayan yeni hadisələrin meydana gəlməsi və bunların hökmlərinin təsbiti üçün ictihad edilməsi;

Bir digər səbəbi də:

farazi fiqh[1] anlayışının yayılmış olmasındandır.

Beləcə fiqhi hökmlərdə ixtilafın genişlənməsinin, elmi və əməli həyatın gərəkdirdiyi təbii bir hal olduğu anlaşılmaqdadır.

## 3. Fiqhi ixtilafların səbəbləri:

Yuxarıda anlatdıqlarımızdan bu xüsus ortaya çıxmış oldu:

Alimlərin, fiqhi məsələlərin istinbatındakı ixtilafı və eyni məsələdə fərqli görüşlər mənimsəmiş olmaları, təbii bir haldır. Çünki bu hal, ixtilaf və görüş ayrılığını qaçılmaz qılan səbəblərdən qaynaqlanmaqdadır.

Nə var ki, bəzi dar görüşlü kimsələrin, bu fiqhi ixtilaflar qarşısında qəribsəyici, yaxud şübhəci bir davranış sərgilədiklərini görürük. Bu mübaliğəli davranışın səbəbi, bəhs mövzusu şəxslərin, (fiqhi hökmlərə qaynaqlıq edən) nasslara yetişmə imkanına sahib olduqdan sonra, alimlərin ixtilaf etmək üçün bir lüzum olmadığına inanmalarıdır.

Elə anlaşılır ki, bu kimsələr nəzərində, fiqhi ixtilafların səbəbi, nassların sabit olub olmamasına bağlıdır. Belə olunca, onlara görə nasslar, -hədislərin səhih hədis məcmuələrində toplanması və səhih olanların zəiflərdən ayrılması kimi fəaliyyətlər nəticəsində- ixtilafın, tərəflərinə çatdığı zaman:

bu ixtilafın ortadan qalxması;

---

1 Meydana gəlməmiş hadisələri meydana gəlmiş kimi fərz edib, hökmünü araşdırmaq. Xüsusilə, İraq torpaqlarında geniş yayılan «təqdiri fiqh» də deyilən bu tərzin, fiqh qabiliyyətinin yerləşməsinə və fiqh elminin geniş yayılmasına son dərəcə əhəmiyyətli təsiri olmuşdur.

izlərinin alimlər arasında silinib getməsi; və

fərqli görüşlərin ixtilafsız bir tək görüşə çevrilməsi lazımdır!

Alimlərin əhkamdakı ixtilafı məsələsi mövzusundakı bu xətalı, səthi baxış, müxtəlif yalnış davranışlara yol açmaqdadır. Bəzi insanlar bu səbəblə, fiqhi ixtilafları gərəksiz, ağır bir yük olaraq görüb üz çevirməkdə, bəziləri də bu mövzunu hədəf taxtasına oturdub (ixtilaflara və ixtilaf edənlərə) hücum etməkdə, onlarla müharibəyə girişməkdədirlər.

Yenə bu səbəblə, bəzi kimsələrin də, -Sünnət, tədvin edilib (bir araya gətirilib tərtib edildiyi) hədis kitabları da hər tərəfə yayıldığı üçün- artıq insanları tək bir görüş və «Kitab və Sünnət məzhəbi» deyə anılan tək bir məzhəb ətrafında toplamaq vaxtının gəldiyi qənaəti ilə, məzhəb və görüşləri birləşdirmək gərəkdiyi çağırışına razı olduğunu görürük. Bu qrupların:

«Din bir, Quran bir, Sünnət bir olduğu halda, bu ixtilafların nə gərəkcəsi ola bilər ki?»

şüarı ilə, bu iddiaları rəğbət görsün deyə  çalışmaqları da diqqət çəkir...

Bu kimsələr, imamların və alimlərin ixtilafların səbəbləri kontekstində qələmə aldıqları əsərlərə müraciət etsələr, görəcəklər ki, ixtilafların yeganə təməl səbəbi olaraq gördükləri «nassdan (burda nassdan məqsəd hədislərdir) xəbərdar olmama» xüsusu, ixtilaf səbəblərinin sadəcə biridir.

Bəhs mövzusu səbəblərdir ki, görüşlərin fərqliləşməsinə yol açmış, istinbat sahəsində ixtilafların meydana gəlməsinə səbəbiyyət vermişdir...

Bəhs mövzusu səbəblərin birdən artıq olması və iç-içə girmiş olması səbəbilə, mövzu haqqında əsər yazmış olan alimlərdən bəziləri mövzunu qısaca ələ alarkən, bəziləri də təfsilatına girişmişdir.

Ancaq bütün bu səbəblərin həqiqətdə 4 əsas səbəbə geri döndüyünü düşünürəm. Digər təfsili səbəblər, bu 4 əsas səbəbdən qaynaqlanmaqdadır:

Bəhsini etdiyimiz səbəblər bunlardır:

## 3.1. Nassın sabit olub olmadığı mövzusundakı ixtilaf:

Burda:

1. Həm nassın, imamlardan birinə çatmışkən, digərinə çatmaması;

2. Həm də imamlardan biri nəzərində sabit olmuşkən, bir digəri nəzərində sabit olmaması bəhs mövzusudur.

Bu ikincisi, hədis ravilərinin (rəvayət edənlərinin) təvsiq və tazifi[1] ilə yalnız bir mətn və ya sənəddə digərinə nisbətlə şazzlıq[2] halının mövcud olması kimi hallarla bağlı olaraq ortaya çıxar.

## 3.2. Nassın necə başa düşüləcəyindəki ixtilaf:

Bütün bunlardan sonra -

1. Zikr edilən xüsuslarda ittifaq təmin edildiyi; və

---

1 Hədis tənqidçiləri tərəfindən ravinin «ədalətli/güvənilən» və ya «zəif/güvənilməz» olması.

2 Şazz: Hədis üsulunda, məqbul ravinin özündən daha məqbul bir ravinin rəvayətinə zidd nəql etməsi. (bax: imam Cəlaluddin əs-Suyuti, «Tədribu'r-Ravi fi şərhi təqribi'n-Nəvəvi», (Əhməd Ömər Haşim təhqiq ilə), Daru'l-Kitabi'l-Arabi, Beyrut, 1409/1989, I-II)

2. Nassın bütün imamlara eyni şəkildə çatdığı; və

3. Səhhəti mövzusunda eyni hökmün verildiyi

fərz edilsə belə-, nassın necə anlaşılacağı mövzusundakı ixtilaf varlığını davam etdirəcəkdir. Bu, ləfzinin bir çox mənaya gələn «müştərək» və ya mənası bəyan edilməmiş «mücməl» bir ləfz olması, -lüğət və bəyan alimlərinin bildiyi- «həqiqət» və ya «məcaz» tərzində gəlməsi kimi, nassın növü ilə bağlı bir ixtilafdır.

Belə hallarda, nassdan muradın nə olduğu, müctəhid tərəfindən açıq bir şəkildə anlaşıla bilməz.

Bu başlıq altında ifadə etdiyimiz ixtilaf, yuxarıda anlatdığımız səbəblərdən qaynaqlana biləcəyi kimi, nassın anlaşılmasında müctəhidlərin qüdrət və imkanlarının fərqli-fərqli olmasından da qaynaqlanır.

## 3.3. Bir birinə zidd nassların arasını birləşdirmək və ya birini digərinə tərcihdəki ixtilaf:

Alimlərin nassın sabit olması və nassəın necə başa düşüləcəyi mövzularında ittifaq etdiyini fərz etsək belə, bir başqa ixtilaf səbəbi, varlığını davam etdirəcəkdir:

Bəhs mövzusu nassın, tərcihə daha layiq bir başqa nassla zahirən zidd halda olması.

Belə hallarda, zahirən bir biri ilə zidd olan nassların arasını birləşdirmək (cəm) və ya birini digərinə tərcih yolları cəhətindən ixtilaf ortaya çıxmaqdadır.

Bu kontekstdə, «nassın necə başa düşüləcəyi » sualının məsələyə böyük ölçüdə təsir etdiyini unutmayaq. Bəhs

mövzusu nasslar arasında ziddiyət olmadığı görüşündə olan müctəhid, (cəm deyil) tərcih variantına yönələcəkdir.

Bir müctəhidin anlayışı, digəri üçün hüccət olmadığı kimi, başqasının görüşünü mənimsəməsi mövzusunda susdurucu da deyildir.

## 3.4. Üsul qaydalarındakı və bəzi istinbat qaynaqlarındakı ixtilaf:

Dördüncü xüsus da, hökmlərin özündən çıxarıldığı qaynağın hüccət olmasındakı ixtilafdır.

Hər imamın, hədislərin qəbul və rəddində, özünə məxsus qayda və şərtləri vardır. Hər biri istinbatda özünə məxsus bir yol və metod izləyir.

Misal üçün:

İmamlardan biri Səhabənin fel və ya fətvasını şəri nass kimi dəyərləndirib, qüvvətli bir hüccət olaraq gördüyü halda, bir digəri bu mövzuda ona müxalifət edir.

Yenə bir imam (imam Malik), Mədinəlilərin əməlini şəri hüccət olaraq qəbul edib, onu digər bir qisim şəri nassların önünə keçirir.

Bir digəri, ravinin rəvayət etdiyi hədisə zidd əməli mövzusunda, o birilərə müxalif bir davranış sərgiləyir.

Yenə imamlardan biri, bir felin nasslarda qadağan edilməsinin, o felin fasid olmasını gərəkdirdiyini söyləyərkən, digəri bunda ona müxalifət edir...

Bütün bu xüsuslar və bənzəri digər məsələlər, Üsul kitablarında təfsilatlı olaraq açıqlanmışdır.

Digər səhifələrdə bu 4 maddəni tək-tək ələ alıb, onların hər

birindən qaynaqlanan ixtilaflar haqqında praktiki misallar zikr edəcəyik.

Burda işarət edilməsi gərəkli olan bir xüsus vardır:

Fiqhi ixtilaflar mövzusunda zikr etdiyimiz bu 4 səbəbin bəzi məsələlərdə iç-içə girmiş olduğunu görürük. Belə hallarda, bir səbəb, digərlərindən ayrılmaz. Çünki müctəhidin izlədiyi yol və metod, anlayış və istinbatına təsir edən xüsuslardandır. Bununla bərabər, müctəhidin, istinad etdiyi və hökm çıxardığı qaynağın da, burda təsiri bəhs mövzusudur.

Bu səbəblə, üsul və metodları bir birinə yaxın olan alimlər arasındakı ixtilafın çəçivəsi daralarkən, digərləri ilə aralarında ixtilaf daha geniş bir sahəyə yayılmaqdadır. Necə ki, mütləq müctəhidlər arasındakı ixtilafın çərçivəsinə baxıldığında, bu xüsus açıqca görülməktədir.

Bu etibarla, bəzilərinin, məzhəbləri və görüşləri, tək bir məzhəbdə birləşdirmə iddiasının -işarət etdiklərim ilə zidd düşdüyü üçün- ciddiyə alınacaq bir yanı yoxdur.

Eyni şəkildə, digərlərinin, alimlərin fiqhi məsələlərdəki ixtilafına hücum etməsi də, dar görüşlülükdən və yalnış anlamaqdan qaynaqlanan bir davranışdır.

Allah Taala'dan, bizi dinimizdə fəqih qılmasını diləyirik. Allah kimə xeyir diləyərsə, onu dində fəqih qılar.

## 3.1. Nassın sabit olub-olmaması mövzusundakı ixtilaf:

Şübhəsiz şəri hökmlərin istinbatında ortaya çıxmış və çıxacaq olan ixtilaf kontekstində, şəri nassın sabit olub-olmaması, ixtilaf səbəblərinin ilk sırasında yer alır.

Çünki şəri nass, bütün müctəhidlər üçün birinci dayanaqdır.

Şəri hökmlərin istinbatı, şəri nass mərkəzində cərəyan edir. Bu etibarla:

1. Nassın sihhətinin sabit;

2. Dəlalətinin açıq olması; və

3. Muarızının (bu nassa qarşı başqa bir nassın) mövcud olmaması

halında, hökm verərkən o nassa dayanılacaqdır.

Müctəhid imamların:

«Hədis səhihdirsə, məzhəbim odur.»

sözünün mənası budur.

Bu qədər var ki, bəzi kimsələr, bu sözdən bunu anlayırlar:

«Hədis, imamlardan hər hansı birinə çatdığı zaman, imam, o hədisin zahiri doğrultusunda görüş bəyan etmək və gərəyincə hökm vermək məcburiyyətindədir. Əgər belə etməzsə, nassı tərk etmiş və hədisdən üz çevirmiş olur.»

Müsəlmanların imamlarından hər hansı birinin, ictihadı gərəyincə, dəlaləti və hökmü məqbul olan bir hədisdən üz çevirməsi, əsla bəhs mövzusu ola bilməz. Onlar:

- dindarlıqları ilə məşhur;
- ədalətləri ilə tanınan;
- təqvaları ilə bilinən imamlardır.

Allah, hamısından razı olsun.

Məsələyə elə baxanlar, demək ki, başa düşmürlər ki, bir hədisin bir imama sadəcə «çatmış» olması başqa şeydir, o hədisin o imam nəzərində sabit olması və tərcihə daha layiq muarızının mövcud olmaması başqa şeydir.

Halbuki, bu cəhət heç şübhəsiz mübahisəsizdir:

İmamlardan hər birinin hökm istinbatında əsas aldığı özünə məxsus qayda, üsul və əsasları vardır. Bunlar:

- hədisin sabit olub-olmamasına dair ola biləcəyi kimi;
- dəlalətinə və mənasına; yaxud
- muarızının mövcud olub-olmamasına;

və b. səbəblərə də bağlı ola bilər. Bu qayda və əsaslarda digər müctəhidlər ona müvafiq də ola bilərlər, müxalif də.

Müctəhidin və ya müctəhidlərin görüşü, üsul və füruda müxalif bir müctəhid üçün bağlayıcı bir hüccət deyildir!

Müctəhid imamların istinbatdakı və nasslar qarşısındakı davranışları, bu dediklərimizi dəstəkləyər. İmamlardan, digər imamlar nəzərində səhih olduğu halda, öz nəzərində səhih olmayan hədislərin ifadə etdiyi hökmlərdə, onlara aid müxalif bir görüş mənimsəyən kimsə yoxdur.

Və ya tam əksinə, öz nəzərində səhih olduğu səbəbilə, bəzi hədislərlə əməl edən bəzi imamlar vardır ki, o hədislər, digər imamlar nəzərində səhih deyildir. (Dolayısı ilə onlar, o hədislərin bildirdiyi doğrultuda əməl etməmişlərdir.)

Vəqfin satıla biləcəyi görüşündə imam əbu Hənifə (rahmətullahu aleyh)'ə müxalif olan və çoxluğu təşkil edən imamlarla eyni görüşü mənimsəmiş olan imam əbu Yusuf (rahiməhullah)'ın bu sözü gözəldir:

«Əgər bu hədis, əbu Hənifəyə çatmış olsaydı, mütləq gərəyincə hökm verər və vəqfin satıla biləcəyi görüşündən rücu edərdi (dönərdi).»[1][2]

---

1 *İbn Həcər Asqalani, «Fəthu'l-Bari», V, 43*

2 Maliki, Şafi və Hənbəli məzhəblərinə və Hənəfi məzhəbindən imam əbu Yusuf ilə imam Muhamməd əş-Şeybani'yə görə, malında təsərrüfə əhil olan bir kimsə malını vəqf edərsə, bunu yerinə gətirməsi gərəkdir. Bu, geri

dönüşü olmayan bir təsərrüfdür və vaqif (malını vəqf edən kimsə), o malın əsli mövzusunda vəqf edilmə məqsədini pozan hər hansı bir təsərrüf edə bilməz:

onu sata bilməz;hibə edə bilməz;miras olaraq buraxa bilməz.

Ömər (radiyallahu anh), özünə aid bir xurmalığı vəqf etmək istədiyini söylədiyində, Peyğəmbər (sallallahu aleyhi və salləm):

«Onun əslini vəqf et. (Beləcə artıq) o satıla bilməz, hibə edilə bilməz, (ona) varis oluna bilməz. Sadəcə onun məhsulu layiq olanlara sərf edilər.» buyurmuşdur.(*Buxari, Vəsaya/23*)

İmam əbu Hənifə isə, vəqfin, vəsiyyət tərzində olması və ya qazı tərəfindən lüzumuna hökm edilməsi halında lazım olacağına hökm etmişdir. Yenə Ona görə, vaqif, vəfat xəstəliyində malının bütününü vəqf etmişdirsə, öldükdən sonra varisləri, mirasın 1/3-indən artığını geri ala bilərlər.

İbn əbi'l-Avvam'ın İsa b. Əban'dan nəql etdiyinə görə, imam əbu Yusuf Kufədən Bağdada gəldiyi zaman, imam əbu Hənifə'nin, vəqfin -bəzi hallarda- satıla biləcəyi görüşünü paylaşırdı. Bağdadda özünə Ömər (radiyallahu anh)'ın Xeybər'dəki hissəsini vəqf etdiyini bildirən rəvayət nəql edildiyində:

«Bu, müxalifət edilməsi caiz olmayan bir dəlildir. Əgər bu rəvayət, əbu Hənifə'yə çatsaydı, gərəyincə hökm verər, ona müxalifət etməzdi.» dedi. (*Muhamməd Zahid əl-Kəvsəri, «ən-Nuqtətu't-Tarifə fi't-Təhaddus an Rududi ibn əbi Şeybə alə əbi Hənifə», s. 41, İdaratu'l-Quran və'l-Ulumi'l-İslamiyyə, Kəraçi, 1407/1987*)

İmam Səraxsi , imam əbu Yusuf'un Harun ər-Rəşid ilə birlikdə Həcc üçün Mədinəyə getdiyində, orda müşahidə etdiyi tətbiqtlar səbəbilə, bu 3 mövzuda ictihadını dəyişdirdiyini zikr edər:

1. Vəqfin satılması məsələsi;

2. -Bir ağırlıq ölçüsü olan- «sa»nın 8 «ritl» olaraq təqdiri; və

3. Sabah azanının fəcrdən əvvəl oxunması.(*«əl-Məbsut», Xll, 28*)

İmam əbu Yusuf'un bu nəqldə zikri keçən həcc yolçuluğunun, Baş qazılıq vəzifəsini davam etdirmək üzərə Bağdada getdiyi və ordan həccə yola düşdüyü şəklində anlaşılması halında, bu 2 nəql arasında bir ziddiyyət olmayacağı söylənə bilər.

Bu hadisə vəsiləsilə, bilinməsi lazım olan bir xüsus da vardır. Belə ki:

İmam əbu Yusuf'un bu təsbitini ümumiləşdirərək hər hansı bir müctəhid imamın ictihadının, müxaliflik ərz etdiyi bir hədisə rastlayan hər kəsin, o imam adına o ictihadı tərk edib hədisi ala biləcəyini düşünmək doğru deyildir. Çünki:

Mühəqqiq (həqiqətləri dəlillərilə araşdıran, incələyən) alimlər, bu nöqtədə qınanacaq bir xüsus görməmişlərdir. Sadəcə:

Özlərinə müxalifət edənlərə qarşı geniş ürəkli olmağı bacarmayan; və ya

İxtilaf səbəblərini, gərəyi kimi anlayıb idrak edə bilməyəcək qıt anlayışlı olan bəzi kimsələr,

bu xüsusa fərqli baxarlar; ayaqları büdrəyər və məsələni şübhəçi bir nəzərlə ələ alarlar. Belə kimsələrə bu ümmətin keçmişində rast gəlindiyi kimi, bu günündə də rast gəlinməktədir...

Mühəddis (hədis alimi) ibn əbi Zi'b əl-Mədəni (rahmətullahi aleyh)'in, hicrət yurdu imamı- imam Malik haqqındakı davranışı, əvvəldən bəri çirkin görülmüşdür. İmam Malik (rahiməhullah), «Muvatta» əsərində rəvayət etdiyi:

«2 nəfər alış-veriş etdiyində, ayrılmadıqca muxayyərdirlər (sərbəstdirlər).»

---

İlk olaraq, o hədisin «o imamın kriteriyları doğrultusunda» səhih olduğunun ortaya qoyulması gərəkdir. İmamların hər birinin hədisləri «sihhət-zəif» dəyərləndirməsinə tabe tutduğu özünə xas kriteriyaları vardır. Bir imamın səhih gördüyü bir rəvayəti, digəri səhih görməyə bilər.

İkinci olaraq da, o imamın o hədisdən xəbərdar olmadığından əmin olunmalıdır. İmam o hədisdən xəbərdar olmuş, ancaq hədisdə gördüyü bir qüsur/illət olaraq istifadə edilməyə əlverişli görməmiş ola bilər

*Bu mövzu haqqında geniş bir şəkildə öyrənmək üçün bax:*

*Taqiyuddin əs-Subki, «Mə'nə qavli'l-imamu'l-Muttalibi izə sahhə'l-Hədis fəhuvə məzhəbi», s. 100 və d., (Əli Naif Bikai təhqiqi ilə), Daru'l-Bəşairi'l-İslamiyyə, Beyrut, 1413/1993*

*Şah Vəliyullah Dihləvi, «əl-İnsaf fi bəyəni əsbabi'l-ixtilaf», s. 46 və d. (əbu Ğuddə təliqi ilə), Daru'n-Nəfais, Beyrut, 1417/1996*

*Zəfər Əhməd ət-Təhanəvi, «Qavaid fi ulumi'l-Hədis», s. 20 və d. (Əbu Ğuddə təhqiqi ilə), Daru's-Səlam, Beyrut, 1417/1996*.

şəklindəki hədisin zahiri ilə əməl etməmişdir. O, hədisdə keçən: «ayrılma»ğı, «sözlə ayrılmaq» (alış-verişdən daşınmaq) olaraq almışdır. Necə ki, əbu Hənifə'nin görüşü də belədir. İmam Malik, bu hədisin sabit olduğuna inanmaqda, ancaq onun, daha qüvvətli gördüyü bir başqa dəlil ilə muaraza (ziddiyət) halında olduğu qənaətini daşımaqdadır ki, qüvvətli gördüyü bəhs mövzusu dəlil, «Mədinə əhlinin əməli»dir. İmam Malik, Mədinə əhlinin əməlini, Üsul qaydalarından və təşridə və hökm istinbatında baş vurulan qaynaqlardan biri olaraq görməkdədir.

İbn əbi Zi'b, imam Maliki (bəhs mövzusu hədis haqqındakı dəyərləndirməsi səbəbilə) şiddətli bir şəkildə qınamışdır. Hətta belə dediyi rəvayət edilir:

«Malik, tövbəyə dəvət edilər. Tövbə edərsə nə gözəl, etməzsə, boynu vurular.»[1]

Bunu ibn əbi Zi'b'dən imam Əhməd nəql etmiş və belə deyərək də tənqid etmişdir:

«Malik, hədisi rədd etməmiş, lakin o şəkildə təvil etmişdir.»[2]

Müctəhidlər və digər alimlər, hədislərin qəbulu üçün bəzi qayda və əsaslar təsbit etmişlərdir. Mövzuya gərəyi kimi vaqif ola bilməyən bəzi kimsələr:

bəhs mövzusu qayda və əsaslarda ixtilafa yer olmadığını; və

müctəhidlərin bu nöqtədə mühəddislərin qəbul etdiyi əsaslar çərçivəsində hərəkət etmək məcburiyyətində olduğunu düşünür.

Bu, xətalı bir düşüncədir. Çünki praktika, bizə bunu öyrədir ki, müctəhidlərin -ki, onlar həm hədis, həm də fiqhdə imamdırlar-

---

*1 bax: imam Əhməd b. Hənbəl, «əl-İləl», I, 193; Xatib əl-Bağdadi, «Tarixu Bağdad», II, 302*

*2 İbn əbi Ya'la, «Tabaqatu'l-Hanabilə», I, 251, Matbaatu'l-Sunnəti'l-Muhamməddiyyə*

hökm istinbatında müəyyənləşdirdikləri və başqalarınkına nəzərən tərcihə daha uyğun olan (özlərinə məxsus) qayda və əsasları vardır.

Xüsusilə də, hədis elminin tədvin edilib sabitləşdiyi vaxtlardan əvvəl yaşamış olan imamlar üçün də bu belədir. Çünki Allah Taala'nın bəxş etdiyi ictihad mərtəbəsi, onları, hər hansı bir elm sahəsində bir başqasını təqlid dərəcəsinə düşməkdən qorumuşdur.

Hədisin o imamlardan bir qismi nəzərində sabit, digərləri nəzərində isə, qeyri-sabit qəbul edilməsi nəticəsini doğuran bəhs mövzusu qayda və əsaslardakı ixtilafa dair misallar, həm çoxdur, həm də üsul və füru sahələrinə dağılmış vəziyyətdədir. Burda bu ixtilafın səbəblərini izah edici mahiyyətdə bir neçə misal zikr etmək, bizim üçün kifayət edəcəkdir:

### 3.1.1. Məstur ravinin xəbərinin hökmü mövzusundakı ixtilaflar:

«Məstur»: Özündən 2 və ya daha artıq kimsənin rəvayət etdiyi və lakin haqqında nə cərh, nə də tədil edildiyinə dair məlumat mövcud olan ravidir.[1]

Alimlərdən bir qismi, məstur ravini -ilk 3 əsrdə yaşamışdırsa- «adil» (rəvayətinə güvənilən) görmüş və rəvayətini qəbul etmişlərdir. Çünki müsəlman üçün əsl olan «ədalət»dir.

Buna qarşılıq, digər alimlər, məstur ravini «fasiq» kimi dəyərləndirmiş və xəbərlərin sabit olması kontekstində, belə ravilərin rəvayətini, ehtiyatlı davranaraq, dəlil olaraq qəbul etməmişdir.

İmam Səraxsi (rahiməhullah), «Usul» əsərində, bu mövzu haqqında belə deyir:

1 *bax: Muhamməd Acac əl-Xatib, «Usulu'l-Hədis», s. 271, Daru'-Fikr*

«Məstur raviyə gəlincə isə, imam Muhamməd (rahmətullahi aleyh), «Kitabu'l-İstihsan»da, onun xəbərinin fasiqin xəbəri kimi olduğunu açıqca bildirmiş, əl-Həsən (b. Ziyad əl-Lulu) isə, əbu Hənifə'dən, rəvayət mövzusunda məsturun adil ravi mövqeyində olduğunu söylədiyini nəql etmişdir. Çünki Peyğəmbər (sallallahu aleyhi və sælləm)'dən və Ömər (radiyallahu anh)'dan nəql edilən:

«Müsəlmanlar, bir biriləri haqqında (kı şahidlikdə) ədalət sahibləridir.» rəvayəti dolayısı ilə, müsəlmanların ədaləti zahirən (əksinə bir hal bilinmədikcə) sabitdir.[1]

Bu səbəblə əbu Hənifə, məhkəmədə qarşı tərəfə tən etmədikcə, bir haqqın isbatı mövzusunda, məsturun şahidliyi ilə hökm verilməsini caiz görmüşdür.

Bununla birlikdə zamanımızda yaşayanların əhvalı diqqətə alındığında, imam Muhamməd'in «Kitabu'l-İstihsan»da söylədiyi daha doğrudur. Çünki bu zamanda yaşayanlarda fisq daha çoxdur. Bu etibarla, eynilə ədaləti ortaya çıxmadıqca, məhkəmədə şahidliyinə etimad edilmədiyi kimi, ədaləti ortaya çıxmadıqca da, məsturun rəvayətinə də etimad edilməz...» [2]

---

1 Rəvayətin tam mətni belədir:
«Müsəlmanlar, bir biriləri haqqında (kı şahidlikdə) ədalət sahibidirlər. Yalnız böhtandan dolayı, hədd cəzası verilmiş olan müstəsna.» (İbn əbi Şeybə, «əl-Musannəf», X, 641, (Muhamməd Avvamə təhqiqi ilə), Şərikətu Dari'l-Qiblə -Muəssəsətu Ulumi'l-Quran, Beyrut, 1427/2006, I-XXVI).Ömər (radiyallahu anh)'ın sözü olaraq da bu rəvayət, onun əbu Musa əl-Əşari (radiyallahu anh)'a yazdığı məktubda keçməkdədir. Ordakı ləfz:

«...Müsəlmanlar bir biriləri haqqında (kı şahidlikdə) ədalət sahibidirlər. Yalnız hədd olaraq şallaq vurulmuş və ya yalançı şahidlik mövzusunda təcrübə edilmiş (və yalançılığı ortaya çıxmış kimsələr) müstəsna...» şəklindədir.

*bax: Daraqutni, «əs-Sunən», IV, 368, əbu Tayyib Muhamməd Şəmsulhaqq əl-Əzimabadi'nin «ət-Taliqu'l-Muğni»si ilə birlikdə, Aləmu'l-Qutub, Beyrut, 1406/1986, I-IV*

2 *«Usulu's-Səraxsi», I, 370,Ləcnətu İhyai'l-Maarifi'n-Numaniyyə, Hindistan*

Bu qaydanın bizə bildirdiyi budur:

Sənədində «məsturu'l-hal» (yəni halı haqqında məlumat mövcud olmayan) bir ravi mövcud olmuş olsa belə, bir hədis, əbu Hənifə nəzərində özü ilə ihticac edilə biləcək (dəlil olaraq istifadə edilə biləcək) qüvvətdə ola bilər.

Eyni vaxtda eyni hədis, bəhs mövzusu məstur ravi səbəbilə digər alimlər tərəfindən təz'if edilmiş (zəif görülmüş) ola bilər. Bu halın, hökm və istinbatda ixtilafa yol açmasında, başa düşülməyəcək bir tərəfi yoxdur!

### 3.1.2. Mürsəl hədisin dəlil olub-olmadığı mövzusundakı ixtilafları:

Fəqihlər və üsulçuların məfhumlarında, «mürsəl hədis», səhabə olmayan ravinin, bir başa Allah rəsulu (sallallahu aleyhi və səlləm)'dən nəql etdiyi hədisdir.[1]

İmam Səraxsi, «Usul» əsərində belə deyir:

«İkinci və üçüncü əsrlərin mürsəllərinə gəlincə, alimlərimizin (Allah onlara rəhmət etsin) görüşünə görə, belə hədislər hüccətdir. Şafi isə:

Bir ayət və ya məşhur sünnətlə təyid edilmədikcə (dəstəklənmədikcə, qüvvətləndirilmədikcə); yaxud

Sələf dönəmində özü ilə yayğın bir şəkildə əməl edilmiş olmadıqca; ya da

Başqa bir yoldan muttasıl (kəsintisiz, bitişik, qopuqluq olmayan) bir sənədlə (Allah rəsuluna qədər çatacaq şəkildə) gəlmədikcə, mürsəl hədisin dəlil olmayacağını söyləyir və belə deyir:

---

1 *Muhamməd Acac əl-Xatib, «Usulu'l-Hədis», Daru'l-Fikr, s. 334-335*

‘Bu səbəblə, Səid b. əl-Musəyyəb’in mürsəl rəvayətlərini hüccət olaraq qəbul etdim. Çünki onun mürsəl rəvayətlərini incələdim və başqa sənədlərlə müsnəd olaraq nəql edildiklərini təsbit etdim.»

Daha sonra Səraxsi, 2 tərəfin dəlillərini və tərcihə uyğun görüşləri zikr edir.[1]

### 3.1.3. Ravinin, öz rəvayətini inkar etməsi halında necə hərəkət ediləcəyi mövzusundakı ixtilaf:

Alimlər, bir hədis rəvayət etdikdən sonra onu inkar edən və rəvayət etmədiyini söyləyən ravinin rəvayəti mövzusunda ixtilaf etmişdir. İmam əbu Hənifə və əbu Yusuf (rahmətullahi aleyhimə), bu halda o hədislə əməl edilə bilməyəcəyini söyləyərkən, imam Şafi və imam Muhamməd isə, o hədis ilə əməl ediləcəyi görüşünü mənimsəmişlərdir.

Bunun misalı və açıqlaması, Səraxsi tərəfindən «Usul» əsərində belə zikr edilir:

«Bunun açıqlaması Rəbia’nın, Suheyl b. əbi Salih’dən nəql etdiyi: ‘bir şahid və andla hökm vermə’ hədisində mövcuddur. Bu mövzudakı hədisi nəql edən Suheyl’ə:

‘Bu hədisi Rəbia səndən nəql edir.’

deyildiyində xatırlamamış və o andan sonra hədisi belə deyərək rəvayət etmişdir:

‘Rəbia, mənə məndən rəvayət etdi ki, o, siqadır (güvəniləndir)...’

Səraxsi belə davam edir:

---

1 *Səraxsi, «Usul», I, 360*

«Şafi, ravisinin inkar etdiyi hədislə əməl etmiş, alimlərimiz isə, belə hədislə əməl etməmişdir. Süleyman b. Musa, əz-Zühri'dən, o, Urvə'dən, o da Aişə (radiyallahu anha)'dan Peyğəmbər (sallallahu aleyhi və sələm)'in belə buyurduğunu rəvayət etmişdir:

'Hər hansı bir qadın, vəlisinin icazəsi olmadan nigahlanarsa, o nigah batildir...'[1]

«Daha sonra ibn Cureyc, əz-Zühri'dən bu hədis haqqında soruşmuş, ancaq Zühri, bu rəvayəti xatırlamamışdır. İmam Muhamməd və imam Şafi, ravisi inkar etdiyi halda belə rəvayətlərlə əməl etmiş, imam əbu Hənifə və əbu Yusuf isə, ravisi inkar etdiyi üçün belə rəvayətlərlə əməl etməmişdir...» [2]

Nassın alimlərə çatıb-çatmamasına bağlı olaraq meydana gələn ixtilafa verilə biləcək ən açıq misal, Şeyxeyn'in (Buxari və Muslimin), ibn Abbas (radiyallahu anh)'dan nəql etdiyi bu hadisə olsa gərəkdir:

«Ömər b. əl-Xattab (radiyallahu anh) Şama getmək üzərə yola çıxmışdı. Sərğ deyilən yerə gəldiyində, əbu Ubeydə b. əl-Cərrah və dostlarından meydana gələn ordu komandirləri onu qarşıladılar və Şam'da vəba xəstəliyi çıxdığını xəbər verdilər. Ömər:

'Mənə ilk mühacirləri çağır.' dedi. Çağırdım. Onlarla istişarə etdi və Şamda vəba çıxdığını xəbər verərək, edilməsi lazım olanın nə olduğu mövzusunda görüşlərini soruşdu. İxtilaf etdilər. Bir qismi:

'Sən bir iş üçün yola çıxdın, bundan geri dönməyini uyğun görmürük.' deyərkən, digərləri:

'Allah rəsulu (sallallahu aleyhi və səlləm)'in səhabələrindən

---

*1 bax: Sanani, 'Subulu's-Səlam', lll, 155, Məktəbətu'l-Cumhuriyyəti'l-Arabiyyə*

*2 Səraxsi, «Usul», ll, 3*

həyatda qalanlar səninlə birlikdədir, onları bu vəbanın üzərinə aparmağını uyğun görmürük.’

şəklində, öz görüşlərini bildirdilər.

Ömər:

‘Gedə bilərsiniz.’ dedi. Daha sonra mənə: ‘Ənsarı çağır.’ dedi. Çağırdım. Onlarla da istişarə etdi. Onlar da mühacirlərin etdiyi kimi etdilər, ixtilaf etdilər.

Onlara da: «Gedə bilərsiniz.» dedi. Sonra:

«Fəth mühaciri olan Qureyş’in yaşlılarından burada olanları mənə çağır.» dedi. Çağırdım. Onlarsa, görüş birliyi edərək:

«Bərabərindəkilərlə birlikdə geri dönməyin və insanları bu vəba üzərinə götürməməyin, uyğun olacağını düşünürük.» dedilər.

Bunun üzərinə Ömər, insanlara xitabən:

«Mən sabah (geri dönmək üzərə) yola çıxacam; siz də çıxın (buna görə hazırlaşın).» dedi.

Bunun üzərinə əbu Ubeydə b. əl-Cərrah (radiyallahu anh):

‘Allahın təqdirindən mi qaçırsan?’ diyə soruşdu. Ömər (radiyallahu anh):

‘Bunu başqası söyləsəydi, ey əbu Ubeydə...’ [1]

«Bəli, Allahın təqdirindən, yenə Allahın təqdirinə qaçırıq. Sənin dəvə sürün olsaydı və sürünü, biri yaşıl, digəri məhsuldar olmayan 2 yamacı olan bir vadiyə endirmiş olsaydın, onları məhsuldar yerdə otlatmağın da, məhsuldar olmayan yerdə

1 «Bu cümlə:

«Dirayət, anlayış və qabiliyyət sahibi biri olaraq, kaş ki, bunu söyləyən sən olmasaydın.» və ya: «Bunu sən mi söyləyirsən?» şəklində təəccüb vurğulu olaraq anlaşıla biləcəyi kimi;«Bunu başqası söyləsəydi, həddini bildirərdim.» tərzində «tədib» (ədəbləndirmə, həddini bildirmə) vurğulu olaraq da başa düşülə bilər.

otlatmağın da, Allahın təqdiri ilə olmayacaqmıydı?»

«O sırada -bir iş üçün oradan ayrılmış olan- Abdurrahman b. Avf (radiyallahu anh) gəldi (və hadisəyə vaqif olunca) belə dedi:

'Məndə bu mövzu haqqında məlumat var. Peyğəmbər (sallallahu aleyhi və səlləm)'i belə buyurarkən eşitdim:

'Onun (vəbanın) bir yerdə çıxacağını eşidərsənizsə, ora getməyin:

Əgər (sizin olduğunuz bir yerdə) zühur edərsə, ondan qaçmaq məqsədilə ordan çıxmayın.'

Bunun üzərinə Ömər (radiyallahu anh), Allaha həmd etdi və ordan ayrıldı.» [1].

Səhabənin bir qisminə nassın çatmamasının səbəbiyyət verdiyi bu hal, bu misalda açıqca görülməktədir. Bu səbəblə, onlar 2 görüş halında ixtilaf etmişlərdir. Onlar ki, Allah rəsulunun (sallallahu aleyhi və səlləm) əshabıdır!

Bu hədisi -Abdurrahman b. Avf (radiyallahu anh)'a əlavə olaraq- Usamə (radiyallahu anh) da:

«Taun (vəba) xəstəliyinin bir yerdə çıxdığını eşidərsənizsə, oraya girməyin; sizin olduğunuz yerdə zühur edərsə, ordan çıxmayın!» şəklində rəvayət etmişdir. [2]

Bu mövzunun misallarından biri də «riba-i fazl»[3] mövzusunda Səhabələr arasında cərəyan etmiş olan ixtilafdır.

---

*1 bax: Nəvəvi, «Riyazu's-Salihin», 581-582; Buxari, Tibb/29; Muslim, Salam/98. Muttəfəqun aleyhdir (üzərində ittifaq edilən bir məsələdir*

*2 bax: Nəvəvi, «Riyazu's-Salihin», 582-583*

3 Riba'i-fazl:
Eyni cinsdən olan və ölçü/çəki ilə satılan 2 şeyin arada artıqlıq olacaq surətdə (yerindəcə) satılması halında, aradakı artıqlığa «ribai-fazl» deyilir.Məsələn:1 kilo buğdanı, eyni cins 1 kilo 100 qram buğda ilə dəyişdirmək kimi.)

İbn Abbas, ibn Ömər və daha başqa səhabələrdən (radiyallahu anhum), riba-i fazlın caiz olduğu və riba-i nəsiə [1]xaricində riba olmayacağı görüşünü mənimsədikləri rəvayət edilmişdir.

Ancaq bu səhabələr, muttəfəqun aleyh olan əbu Səid əl-Xudri (radiyallahu anh) hədisi ilə [2]

«Qızılı qızılla... misli mislinə olmadıqca satmayın» rəvayətini eşitdikləri zaman ribai-fazlın haram olduğunu söyləyən böyük çoxluğun görüşünə dönmüşlərdir.[3]

Allamə Şəvqani, zikr edilən əbu Səid əl-Xudri (radiyallahu anh) hədisini şərh edərkən belə deyir:

«Bu rəvayətdə riba-i fəzlin haramlığı, açıqca ifadə edilməktədir. Bu babda və başqa yerlərdə zikr edilmiş olan çox hədisin gərəyi olaraq, cumhur bu görüşdədir. Bu rəvayətlər, zikr edilən cinslərin bir birilərilə arada artıqlıq olacaq şəkildə alış-satışının haram olduğunu qəti bir şəkildə hökmə bağlamaqdadır.»

1 Ribai-Nəsiə:
Eyni cinsdən olan 2 şeyin birini digəri müqabilində və ya ayrı cinslərdən olduqları halda, ölçüsü, çəkisi, ədədi... eyni olan 2 şeyin bir biri müqabilində, -qarşılığı iləridə ödənilmək üzərə- satılmasıdır.) 10 qram qızılı.9.10.11 qram qızıl qarşılığıda.-qarşılığı irəlidə verilmək sürətilə-satmaq

2 Əbu Səid əl-Xudri (radiyallahu anh) xaricində, bu məsələdə Osman, əbu Hureyrə, Sa’d b. əbi Vaqqas, əbu’d-Dərda, Ubadə b. Samit, Fədalə b. Ubeyd, Əbu Bəkrə (radiyallahu anhum) kimi səhabələrdən, bu məsələdə ləfzləri bir birinə yaxın hədislər nəql edilmişdir. Əbu Bəkrə (radiyallahu anh)’ın rəvayətinə görə, Allah rəsulu (sallallahu aleyhi və səlləm) belə buyurmuşdur: «Qızılı qızılla ancaq bərabər olaraq satın. Gümüşü gümüşlə ancaq bərabər olaraq satın.» (bax: Buxari, Buyu/77. Adını zikr etdiyimiz səhabələrdən gələn rəvayətlər üçün bax: Taqiyuddin əs-Subki, «Təkmilətu’l-Məcmu’ şərhi’l-Muhəzzəb», X, 59 və davamı, (Muhamməd Nəcib əl-Mutii təhqiqi ilə), Məktəbətu’l-İrşad, Ciddə)

*3 (İbn Abbasın görüşündən döndüyünü bildirən nəqllər üçün bax: İmam Tahavi, «Şərh-u maani’l-Asar, IV, 68, (Muhamməd Zühri ən-Nəccar təhqiqi ilə), Matbaatu’l-Ənvari’l-Muhammədiyyə, Qahirə, 1378/1968)*

İbni Ömər (radiyallahu anh)’dan riba-i fazlı təcviz etdiyi (caiz gördüyü), ancaq daha sonra bu görüşündən döndüyü rəvayət edilmişdir.

Eyni şəkildə, ibn Abbas (radiyallahu anh)’ın da riba-i fazlı təcviz etdiyi nəql edilmişdir. Ancaq onun bu görüşdən dönüb dönmədiyi ixtilaflıdır.

Əl-Hakim’in rəvayətinə görə, əbu Səid (radiyallahu anh), özünə bu babda zikr etdiyimiz hədisi zikr edincə, ibn Abbas da bu görüşündən dönmüş və (əvvəlki görüşü səbəbilə) istiğfar etmişdir. Əbu Səid (radiyallahu anh) hədisini eşitdikdən sonra ibn Abbas (radiyallahu anh) ribai-fazlı, şiddətli bir şəkildə qadağan edirdi.

«...Əl-Hazimi, ibn Abbas (radiyallahu anh)’ın, Ömər b. əl-Xattab və oğlu Abdullahın, Peyğəmbər (sallallahu aleyhi və səlləm)’dən ribai-fazlın haram olduğunu göstərən rəvayəti nəql etdiklərini eşidincə, bu görüşdən döndüyünü və:

‘O ikisi, Peyğəmbər (sallallahu aleyhi və səlləm)’dən mənim əzbərləmədiyim bir şeyi əzbərləmişdir.’ diyərək, (əvvəlki xətalı görüşü səbəbilə) istiğfar etdiyini bildirmişdir.»

«Yenə əl-Hazimi, ibn Abbas (radiyallahu anh)’ın belə dediyini rəvayət edir:

‘Bu, mənim öz rəyimə dayanaraq verdiyim bir hökm idi. Bax budur əbu Səid əl-Xudri! Mənə Allah rəsulu (sallallahu aleyhi və səlləm)’dən (görüşümü nəqz edən) hədis nəql edir. Mən də görüşümü tərk etdim və Peyğəmbər (sallallahu aleyhi və səlləm)’in hədisini əsas aldım.»[1]

Şər’i hökmlərin istinbatında, hədisin, alimlərin bir qisminə çatıb, bir qisminə çatmaması səbəbilə, alimlər arasında meydana gələn ixtilafın misalları çoxdur.

1 *bax: Şəvqani, «Nəylu’l-əvtar», V, 216-7*

Bax imam Şafi! Çox yerdə hökmü, hədisin sihhət və sübutuna bağlı qılmışdır. Hətta ibn Həcər bu mövzuda bir risalə qələmə almış və adını «əl-Minha fi mə Allaqa'ş-Şafiyyu əl-Qavlə bihi alə's-Sıhha» qoymuşdur.

Burda ixtilafın bu növü ilə bağlı olaraq tək bir misal kifayətdir:

«İnə» hədisinin sabit olması və ihticaca (dəlil olaraq istifadə edilməyə) əlverişli olub olmadığı ilə bağlı ixtilaf.

İmam Şafi, «inə satışı»nı[1] qadağan edən hədisin sabit olmadığı qənaətindədir. O, bu hədisi, dəlil olaraq alınmasına əlverişli görməmiş, hədisin bütün təriqlərinin (kanallar, yollarının) zəif olduğunu söyləmişdir.

Alimlərin cumhuru isə, bu xüsusda ona müxalif qənaət mənimsəmiş, zəif olmasına rəğmən, «inə hədisi»ni etibara almışdır.

Cumhura görə, hər nə qədər bu hədis zəif isə də, fərqli təriqləri bir birini təqviyə edir (dəstəkləyir, qüvvətləndirir) və təqviyə nəticəsində, hədis, «inə satışı»nın haram olduğu hökmünə dəlil təşkil etməyə əlverişli hala gəlir. Mühəqqiq (həqiqətləri dəlillərilə incələyən, ortaya qoyan, təhqiq edən) alimlərin məsələ haqqındakı tərcihə uyğun görüşü də budur.

Bu nümunədə, hədisin sabit olub-olmadığı məsələsindəki görüş ayrılığının, fəqihlərin ixtilafına təsiri, açıq bir şəkildə görülməkdədir.

Heç bir imam yoxdur ki, insanlardan bəzilərini, ictihadlarında və hökmlərində, zahirən hədislərə müxalifət və şər'i naslardan üz çevirdiyi zənninə sövq edəcək bir davranış sərgiləməmiş

---

1 Bəy'u'l-İnə:
Bir malı, qarşılığı daha sonra ödənmək üzərə, müəyyən bir miqdara satdıqdan sonra, satıcının, eyni malı daha az bir qarşılığa yerindəcə geri alması şəklində cərəyan edən fel. (Təfsilatlı məlumat üçün bax: «əl-Məvsuatu'l-Fiqhiyyətu'l-Kuveytiyyə», IX, s. 95 və davamı)

olsun.

Halbuki, bu məsələdə, imamların hər hansı bir məsuliyyəti yoxdur. Madam ki, onlar, dəlili bilmə və dəlildən hökm çıxarma işini haqqı ilə yerinə gətirə bilmək üçün bütün güclərini sərf etmişlərdir; elə isə, hər halda savab alacaqlardır.

Məğrib hafizi ibn Abdi'l-Bərr, bu qəbil şübhələri ortadan qaldırmaq və cahillərin, şəri nasslara müxalifətlə ittiham etdikləri müctəhid imamları müdafiə sədədində, belə deyir:

«Bu ümmətin alimlərindən heç kim, Peyğəmbər (sallallahu aleyhi və səlləm)'dən gələn bir hədis təsbit etdikdən sonra, gərəkçəsiz olaraq ona müxalifət etməmişdir. Bu gərəkcə:

1. Bəhs mövzusu hədisin özü kimi bir hədis ilə, icma ilə və ya qəbul etdiyi bir əsl doğrultusunda əsas alınması lazım olan əməl ilə nəsx edildiyini; (imam Malik nəzərində Mədinə əhlinin əməli kimi)

2. Sənədində (sihhəti yaralayan) bir qüsr mövcud olduğunu söyləməsidir.

Bu tərz bir gərəkçə olmadan, hədisə müxalifət edən bir kimsə, «imam» olaraq qəbul edilməsi bir yana dursun, «ədalət» sifətini itirər və fasiq olar...»[1]

İbn Abdi'l-Bərr'in bu bəyanı, alimlərin şəri nasslar qarşısındakı halını son dərəcə nəzərə çarpıcı bir şəkildə ortaya qoymaqda; xalqı, fiqh və fəqihlər haqqında tərəddüdə düşürən cahillərin, alimlərin ixtilaf səbəbləri mövzusunda yaydığı şübhələri açıq bir şəkildə ortadan qaldırmaqdadır...

## 3.2. Şəri nassların fərqli anlaşılması səbəbilə

1 *İbn Abdi'l-Bərr, «Cami'u Bəyani'l-ilm və fadlih və mə yənbəği fi rivayətihi və hamlih», II, 148, (əbu'l-Əşbal əz-Zuheyri təhqiqi ilə), Dar'u ibnu'l-Cevzi, Riyad, 1414/1994, I-II*

## ortaya çıxan ixtilaf:

Bəzən alimlər, mənimsədikləri qaydalar doğrultusunda, hədisin özlərinə çatmasında və ya sabit olmasında ittifaq etdiyi halda, bu sabit nassın necə anlaşılacağı və ondan necə hökm çıxarılacağı mövzusunda ixtilaf edirlər. Bu halda «alimlərin anlayışı», fiqhi ixtiflar üçün ikinci səbəb təşkil edir.

Bu səbəbi 2 əsas nöqtədən ələ ala bilərik:

### 3.2.1. Nassın quruluşu ilə bağlı hallar.

### 3.2.2. Nassın necə anlaşılacağı məsələsində müctəhidin halı.

İndi bunları izah edək:

### 3.2.1. Birinci hal, nassın quruluşu ilə bağlıdır.

Məlum və məşhur olduğu üzərə, Ərəb dilində, nə bildirdiyi sarih (açıq) ifadələr mövcud olduğu kimi, birdən artıq mənaya ehtimal verən müştərək, mücməl... ifadələr vardır.

Misal üçün, «ayn» kəliməsi, ərəb dilində bir neçə mənaya gələn/müştərək bir kəlimədir; bir neçə fərqli şeyi anlatmaq üçün istifadə edilir. İstifadə edildiyi yerdə, bu mənalardan hansının qəsd edildiyi, qərinələrin köməyi ilə bilinir.

«Raəytu aynən» (bir «ayn» gördüm) kimi bir cümlə bəhs mövzusu olduğunda, görülən şey axan bir su qaynağı da ola bilər, insan gözü də, casus da. Çünki «ayn» kəliməsi bütün bu mənaları öz bünyəsində, quruluşunda toplayan «müştərək» bir kəlimədir.

Bu halda şəri nass, belə müştərək bir kəlimə ehtiva etdiyi zaman, ümumilikdə, onunla nəyin murad edildiyini

müəyyənləşdirmədə ixtilaf baş verir. Bunun ən açıq misalı:

«Boşanmış qadınlar, 3 ‘qur’ gözləməlidirlər...» (Bəqərə/228) ayətində keçən «qur» kəliməsidir.

Bu kəlimə, ərəb dilində birdən çox məna verir.

• İçində keçdiyi cümlədə «heyz» mənasına gələ biləcəyi kimi,

• (2 heyz arasındakı) təmizlik müddəti mənasına da gələ bilir;

• Hətta hər 2 məna da qəsd edilmiş ola bilər.

Əbu Amr b. əl-Ala belə deyir:

«Ərəblərdən bir qismi heyzə, bir qismi təmizlik müddətinə, bir qismi də həm heyz, həm təmizlik müddətlərinin ikisinə birdən «qur» deyirlər.»[1]

Bu şəri ləfz, birdən çox mənaya ehtimallı olduğu üçün alimlər, zikr edilən ayətdə keçən «3 qur» təbirinin nə bildirdiyi mövzusunda ixtilaf etmişlərdir. İmam Qurtubi, təfsirində belə deyir:

«Alimlər burdakı ‘3 qur’ mövzusunda ixtilaf etmişlərdir:

• Kufəlilər, onun heyz olduğunu söyləyərkən -ki, bu, eyni zamanda:

Ömər; Əli; ibn Məs’ud; əbu Musa; Mücahid; Qatadə; əd-Dahhaq; İkrimə; və əs-Süddi’nin də məzhəbidir-;

• Hicazlılar, «təmizlik müddəti» olduğunu söyləmişlərdir.

Aişə; ibn Ömər; Zeyd b. Sabit; əz-Zühri; Əban b. Osman; və Şafi də bu görüşü mənimsəmişdir.»[2]

---

*1 Qurtubi, «əl-Cami li ahkami’l-Quran», III, 113*

*2 Qurtubi, «əl-Cami li ahkami’l-Quran» təfsiri, III, 113, Bəqərə/228 ayəti*

Heysəmi'nin «Məcmau'z-Zəvaid»də, ibn Ömər (radiyallahu anh)'dan nəql etdiyi:

«Qurana tahir/təmiz olandan başqası toxuna bilməz.» hədisində keçən «tahir/təmiz» kəliməsi də belədir.

Bu hədisi, Taberani, «əl-Kəbir» və «əs-Sağir»də nəql etmişdir, raviləri təvsiq edilmiş (güvənilən görülmüş) kimsələrdir. [1][2]

Sanani, «Subülü's-Səlam» də belə deyir:

«Tahir kəliməsi müştərək olub bir neçə mənaya gəlir:

• Onunla böyük hədəs (cünubluq) qəsd edilmiş ola biləcəyi kimi,

• Kiçik hədəs (dəstəmazsızlıq) da qəsd edilmiş ola bilər. Eyni şəkildə, bu kəlimə ilə:

• Mömin kimsə də, bədənində nəcasət olmayan kimsə də, murad edilmiş ola bilər.»[3]

Digər yandan, ehtimal və müştərəklik, kəlimədə ola bildiyi kimi, üslub və tərkibdə də ola bilər.

**3.2.2. İkinci hala gəlincə,** burdakı ixtilaf, müctəhiddən, onun anlayış tərzindən qaynaqlanır. Bu, birincidən daha açıq bir haldır. Çünki insanların ağıl və anlayış baxımından bir birindən fərqli olduğu, açıq bir həqiqətdir.

Bu halla bağlı açıq misallardan biri, Peyğəmbər (sallallahu aleyhi və səlləm) dövründə, Bənu Qureyza hadisəsində [4]

1 *Heysəmi, «Məcmau'z-Zəvaid», I, 267*

2 Bu, səhabədən Amr b. Hazm, ibn Ömər, Hakim b. Hizam, Osman b. əbi'l-As və Səvban (radiyallahu anhum)'dan nəql edilmiş səhih bir hədisdir. (*Hədisin taxrici üçün bax: (Zeylai, «Nasbu'r-Rayə li Ahadisi'l-Hidayə», I, 196 və d. Muhamməd Avvamə təhqiqi ilə, Muəssəsətu'r-Rəyyan, Beyrut, 1418/1997*)

3 *Subülü's-Səlam, I, 68*

4 Allah rəsulu (sallallahu aleyhi və səlləm) Mədinəyə hicrət etdiyində, Mədinənin idarəsini və orda yaşayan müsəlmanlarla yəhudilər arasındakı

cərəyan edən hadisədir.

Buxari və Muslim'in, «Səhih»lərində, ibn Ömər (radiyallahu anh)'dan nəql etdiyinə görə, Peyğəmbər (sallallahu aleyhi və səlləm) Xəndək döyüşündən geri qayıtdığında, Cəbrail (əleyhissəlam), Ona gələrək, təcili bir şəkildə, Bənu Qureyza üzərinə getməsini söylədi. Bunun üzərinə, Peyğəmbər (sallallahu aleyhi və səlləm) öz səhabələrini tələsdirərək:

«Qəti olaraq, Bənu Qureyza'ya çatmadan, kimsə əsr namazını qılmasın.» buyurdu.

Bunun üzərinə yola çıxdılar. Lakin Bənu Qureyza'ya çatmadan əsr vaxtının namazı girdi. Bir qismi:

«Bənu Qureyzaya çatmadıqca namazı qılmayaq.» deyərkən, digərləri:

«Əksinə, əsr namazını burda qılaq. Peyğəmbər (sallallahu aleyhi və səlləm) əsr namazını xüsusilə Bənu Qureyza torpağında qılmağımızı istədiyi üçün elə buyurmuş deyil» (bizim bunu təcili etməyimiz üçün elə buyurdu). dedilər.

---

münasibətləri tənzimləyən bir mətn hazırlatmışdı. Bu mətndə zikr edilən tərəflərdən hər hansı biri, üçüncü tərəflə döyüşdüyündə, mətndə zikr edilən digər tərəf, onlara kömək etməklə mükəlləf idi. Müsəlmanlar başqaları ilə döyüşdüyündə, yəhudilər onlara kömək edəcəkdi. Qureyşlə və Qureyşə kömək edənlərlə dostluq münasibətləri qurulmayacaqdı. (bax: ibn Hişam, «əs-Sirətu'n-Nəbəviyyə», ll, 503-4, (Mustafa əs-Səqqa, İbrahim əl-Əbyari, Abdulhafiz Şələbi təhqiqi ilə), Muəssəsətu't-Tarixi'l-Arabi, Beyrut, 1413/1993)

Ancaq zaman içində, müxtəlif bəhanələrlə, Yəhudi qəbilələri də -Bənu Nadir yəhudilərinin təhrikləri ilə- Xəndək döyüşündə müsəlmanların məğlubiyyətə uğrayacaqları ehtimalı ilə, andlaşmanı pozdular və Peyğəmbər (sallallahu aleyhi və səlləm)'i təhqir etdilər. Bunun üzərinə, Xəndək döyüşündə Bənu Qureyza mühasirəyə alındı. 25 gün davam edən mühasirə nəticəsində, Yəhudilər, Sa'd b. Muaz (radiyallahu anh)'ın hakimliyi ilə, məsələnin həll edilməsini istədilər. Sa'd (radiyallahu anh) da, andlaşmaya xəyanət edən yəhudilərin əli qılınc tuta bilən kişilərinin öldürülməsinə hökm etdi və bu hökm, tətbiq olundu. (Daha təfsilatlı məlumat üçün bax: ibn Hişam, «əs-Sirətu'n-Nəbəviyyə, lll, 232, 244 və d...; Təbəri, «Tarixu'r-Rusul və'l-Muluk», ll, 681, Muhamməd əbu'l-Fadl İbrahim təhqiqi ilə, Daru'l-Maarif, Qahirə, tarix yoxdur)

Daha sonra bu halı Ona bildirdiklərində, Peyğəmbər (sallallahu aleyhi və səlləm), hər 2 qrupun görüşünü də uyğun gördü, onlardan hər hansı birini qınamadı.[1] [2]

Peyğəmbər (sallallahu aleyhi və səlləm), Özündən eşitdikləri bir sözü fərqli şəkillərdə anlayanların bu ixtilafını təsdiqləmişdir. Onlar ki, Onun səhabələridir; sabah-axşam, həzərdə və səfərdə Onunla birlikdədirlər; Allahın kəlamını Ondan eşidib alan kimsələrdir. Dolayısı ilə, Peyğəmbər (sallallahu aleyhi və səlləm)'in muradını ən yaxşı anlayanlar onlardır. Çünki bir kimsənin, danışdığında nə qəsd etdiyini, ən yaxşı onun dostları bilər (Allah hamısından razı olsun).

Bu məsələdə Səhabədən bəzilərinin ictihadı -nassın zahirini əsas aldıqları üçün-, namazın bilərək vaxtından geriyə ertələnməsinə yol açmışdır.

Digərlərinin ictihadı isə, nassın zahirinə müxalifətə götürmüşdür. Bu səbəblə, bu ikinci qrup, namazı yolda qılmışlardır.

Bax eynilə Səhabənin burdakı ixtilafı kimi, alimlər də, nassların nəyə dəlalət etdiyi nöqtəsində, 2 anlayışdan birini tərcihdə ixtilaf etmişlərdir. İbnu'l-Qayyim əl-Cevziyyə və daha başqaları (zikr edilən misalda keçən) ikinci anlayışı tərcih etmişlərdir.

Həcc hökümləri də bu nümunələr altında dəyərləndirilə bilər. Peyğəmbər (sallallahu aleyhi və səlləm) bircə dəfə həcc etmiş və həcc vəzifəsindəki ibadətlərin Özündən alınmasını (yəni Özü necə həcc edirsə, həccin elə yerinə yetirilməsini) əmr buyurmuşdu.

---

1 Rəvayətdə bəhs mövzusu edilən namaz, Buxari və daha başqaları tərəfindən «əsr» namazı olaraq zikr edilərkən, Muslim və daha başqaları tərəfindən «zöhr» namazı olaraq zikr edilmişdir. Doğrusu «əsr» namazı olmalıdır, Allahu alim. *(bax: Buxari, «Cumua/5, «Məğazi»/28; Muslim, «Cihad»/69)*

2 *İbn Həcər, «Fəthu'l-Bari», VIII, 411, əl-Matbaatu's-Sələfiyyə*

Belə olduğu halda, Səhabə, Tabiun və müctəhid imamlar arasında, həcclə bağlı bəzi hökmlərdə geniş bir ixtilaf sahəsi mövcud olduğunu görürük. Bu ixtilaf, bir yöndən həccə bağlı rəvayətlərin fərqliliyindən, bir yöndən də, Allah rəsulu (sallallahu aleyhi və səlləm)'in həcdə etdiyi fellərin fərqli başa düşülməsindən qaynaqlanmaqdadır.

Bu ixtilafda tərəflərdən biri, qərinələr və qəti olmayan hallardan hərəkətlə bəzi həcc fellərinin vacib olduğunu söyləyərkən, digəri məndub olduğunu söyləmişdir, ki, bu nöqtə, həcc ibadətləri kontekstində məlum və məşhurdur.

Yazımızın bu hissəsi, ələ aldığımız bu məsələ haqqında daha çox misal zikr etməyə əlverişli deyildir. Fiqhi ixtilaflar mövzusunda elm və anlayış sahiblərincə qələmə alınmış kitablara bir göz gəzdirildiyində belə, burda işarət etdiyimiz nöqtənin həqiqəti, hər hansı bir qarışıqlıq və müəyyənsizliyə mahal olmadan ortaya çıxacaqdır.

## 3.3. Bir birinə zidd olan nassların arasını birləşdirmək və birini digərinə tərcihdəki ixtilaf:

Bəzi şəri nassların zahiri, bir biriylə ziddiyyət təşkil edə bilər. Belə hallarda alimlər:

1. Bu nasların zahiri ifadələrinin arasını cəm etməkdə; və

2. Mənalarını bir birinə uyğun şəklə gətirməkdə; yaxud

3. Birini digərinə tərcihdə ixtilaf edirlər.

Bu da, şəri əhkamda ixtilafla nəticələnən hallardan biridir.

Alimlər,məsələyə aidiyyəti olan dəlillərin tamamı ilə əməl edə bilmək üçün, ilk əvvəl, bu tərz nasların arası, mümkün

olduğu qədər, cəm etməyə çalışırlar. Aralarını birləşdirmək mümkün olduğu və ortadan qaldırıla bilməyəcək bir ziddiyyət bəhs mövzusu olmadığı müddətcə, alimlər,bu cür nasların bir qismini, digərinə tərcih yoluna getməzlər. Çünki ziddiyyət,müctəhidin anlayışı və elmi idrak tərzi dolayısı ilə ortaya çıxan bir haldır. Yoxsa həqiqətdə uca Şəriətdə ziddiyyət olmaz.

Cəm və tərcih, görüşlərin fərqliliyinin və nəzərlərin dərinliyinin meydana çıxdığı incə bir mövzudur. Bəzən bir müctəhidin bu nöqtədə mənimsədiyi bir izah tərzi, digərləri tərəfindən düşünülməmiş ola bilər. Yaxud bir açıqlama tərzi, müctəhidlərdən birinin qəlbinə yatar, lakin bunda digərləri ona müvafiq olmaz...

Bu səbəblə, cəm və tərcih məsələsi, şəri hökmlərin istinbatında, fəqihlərin ixtilafının və müxtəlif nasslar qarşısındakı mövqe fərqliliyinin səbəblərindən ən əhəmiyyətlisini təşkil edir.

Məsələnin həssaslığı səbəbilə, müctəhid imamların bəzi izah tərzləri, kimi insanlar tərəfindən başa düşülə bilməməkdə, dolayısı ilə, belə kimsələr, müctəhid imamların bəzi nassları bilmədiyi, şəxsi görüşlərini əsas alaraq nassa müxalifət və nassı tərk etdiyi zənninə qapıla bilməkdədirlər.

Burda imamların, zidd naslar qarşısındakı mövqelərini göstərən bəzi misallar zikr edəcəyik. Bunu edərkən, sadəcə şəri naslar arasındakı ziddiyyəti bəhs mövzusu edəcək, in şə Allah irəlidə gələcək «4-cü səbəb» zimnində zikr ediləcək olan «naslarla ictihadi üsullar arasındakı ziddiyyət» məsələsinə girməyəcəyik. Bu, fəqihlərin ixtilaf səbəbləri arasında özünə məxsus yeri olan bir mövzudur.

Zidd nassların birini digərinə tərcih səbəbləri çoxdur. Üsul alimləri, bunları kitablarında təfsilatlı olaraq açıqlamışlardır. Bəziləri bunları 4 əsas nöqtədə toplamışdır:

1. Zidd nasların sənədinə dair tərcih:

Mütəvatir nassın məşhur nassa və ya elmi və zəbti daha üstün olan ravinin rəvayətinin digərinə tərcihi belədir.

2. Zidd nasların mətninə dair tərcih:

Naslardan birinin əmr, digərinin nəhy (qadağa) ehtiva etməsi də belədir. Bu halda, nəhy edici nass, digərinə tərcih edilir. Yaxud ziddiyyət, həqiqi bir mənaya dəlalət edən nassla, məcazi bir mənaya dəlalət edən nass arasındadır. Belə bir halda, həqiqət, məcaza tərcih edilir.

3. Ziddiyyət təşkil edən nasların, öz mədluluna (dəlalət etdiyi şeyə/mənaya) dair tərcih:

Naslardan bir qisminin mədlulunun tahrim (haram qılma), digərinin ibahə (mübah qılma) bildirməsi, belədir. Bu halda, tahrim bildirən nass, ibahə bildirənə tərcih edilir.

4. Zidd nasların xaricindəki bir xüsusa dayanan tərcih:

Naslardan birinin -Kitab, sünnət, icma, qiyas və bunlar xaricindəki- bir başqa dəlilə uyğunluq ərz etməsi, onunla ziddiyyət təşkil edən digər nassın isə, belə bir haldan yoxsul olması da, belədir. Təbiəti etibarı ilə, belə bir halda, digər dəlilin təyid etdiyi (qüvvətləndirdiyi, dəstəklədiyi) nass, digərinə tərcih ediləcəkdir.

Fiqh-üsulu kitablarının bu məsələyə bağlı bölmələrində, bunlar xaricində də tərcih səbəbləri zikr edilmişdir.[1]

Şəri nasslar arasında mövcud olan və alimlərin əhkamda ixtilaf etməsinə səbəbiyyət verən ziddiyyət mövzusunda, bu misalları zikr edə bilərik:

---

1 *bax: əl-Amidi, «əl-İhkam fi Usuli'l-Əhkam», lV, s. 324 və davamı, Matbaatu'l-Maarif, Misir, 1332/1913)*

### 3.3.1. Alimlərin, Küsuf (günəş tutulması) namazının qılınış şəkli və bu namazdakı qiraətin necə edilməsi mövzusundakı ixtilafı:

İmam Malik, Şafi, Hicazlıların əksəriyyəti və imam Əhməd, Küsuf namazının 2 rükət və hər rükətdə 2 rüku olduğu görüşündədirlər.

İmam əbu Hənifə ilə Kufəlilər isə, Küsuf namazının, eynilə Bayram namazı [1]və ya cümə namazı kimi qılınan 2 rükətlik bir namaz olduğunu söyləmişlərdir.

Bunun səbəbi, Küsuf namazının necə qılınacağı mövzusunda bir çox ixtilaflı hədisin varid olmasıdır. Bunlar arasında, Peyğəmbər (sallallahu aleyhi və səlləm)'in bu namazı 2 rükət olaraq və hər rükətdə 2 dəfə rüku edərək qıldığını bildirənlər mövcuddur.

Aişə (radiyallahu anha)'dan nəql edilən bu rəvayət, buna nümunədir:

«Allah rəsulu (sallallahu aleyhi və səlləm) zamanında günəş tutulmuşdu. Peyğəmbər (sallallahu aleyhi və səlləm) xalqa namaz qıldırdı. Qiyamı uzun tutdu. Sonra rükuya getdi, rükunu uzun tutdu. Sonra doğruldu və uzun müddət qiyamda durdu. Bu var ki, bu duruşu, birinci qiyamdan daha qısa idi. Sonra (təkrar) rükuya getdi və rükunu uzatdı. Bu rükusu da, ilkindən daha qısa idi...»

İbn Abbas (radiyallahu anh)'dan gələn rəvayət də, bu Aişə (radiyallahu anha) hədisini təyid edən mahiyyətdədir.

İmam əbu Hənifə ilə Kufəlilərin dəlili isə, Peyğəmbər (sallallahu aleyhi və səlləm)'in bu namazı digər (2 rükətli)

---

1 Burda qəsd edilən, Küsuf namazının «rükət və rüku ədədi baxımından» cümə və bayram namazına bənzədiyidir. Yoxsa bayram namazının, içində artıq təkbirlər alınması cəhətindən digər 2 rükətli namazlara bənzəmədiyi açıqdır.

namazlar kimi, (tək rüku ilə) qıldığını bildirən səhih hədislərdir. Misal olaraq, əbu Bəkrə və başqa səhabələr, günəş tutulduğunda (Allah onlardan razı olsun) Peyğəmbər (sallallahu aleyhi və səlləm)'in bayram namazı kimi 2 rükət namaz qıl(dır)dığını rəvayət etmişdir.

İbn Abdi'l-Bərr ilk qrupun əsas aldığı rəvayətlər haqqında bunları deyir:

«Bu ikisi, bu mövzuda zikr edilmiş ən səhih hədislərdir. Nəql cəhətindən bu 2 hədisi əsas alıb bu mövzudakı digər (müxalifi) rəvayətlərə tərcih edənlər:

'Küsuf namazı, tək rükətdə 2 rüku ilə qılınan bir namazdır.» deyirlər...

Daha sonra zidd hədislər haqqında da belə deyir:

«Bunlar da hamısı səhih olan məşhur rəvayətlərdir. Bunlar içində ən gözəli, əbu Qilabə'nin, ən-Numan b. Bəşir (radiyallahu anh)'dan nəql etdiyi bu hədisdir:

'Günəş tutulduğunda, Peyğəmbər (sallallahu aleyhi və səlləm), bizə, sizin (2 rükətli hər hansı bir) namazınız kimi namaz qıldırdı. 2 rükət-2 rükət olmaq üzərə (normal şəkildə) rüku və səcdə edərək qıldırdı və (dua edərək) Allah Taala'dan əmin-amanlıq dilədi. Günəş açılana qədər belə davam etdi.'

Saylarının çoxluğu və muhtəvalarının (ehtiva etdiyi şeylərin) qiyasa uyğunluğu, yəni sair namazlara bənzəməsi səbəbi ilə, bu rəvayətləri tərcih edənlər də:

'Küsuf namazı (normal olaraq qılınan) 2 rükətdir.' deyirlər...»[1]

Bəzi alimlər də, bu məsələyə bir başqa cəhətdən baxmış və bu zidd rəvayətlərin arasını cəm etməyə çalışmışdır.

ibn Cərir ət-Təbəri bunlardandır. O, bu baxış tərzindən

1 bax: ibn Rüşd, «Bidayətu'l-Muctəhid və Nihayətu'l-Muqtəsid», I, s. 215, Məktəbətu'l-Kulliyəti'l-Əzhəriyyə, 1386/1996

hərəkətlə, Küsuf namazının hər iki cür də qılına biləcəyini və bu mövzuda insanın muxayyər (seçimində sərbəst) olduğunu söyləmişdir.

Bu etibarla, Küsuf namazını 2 tərzdə qılmaq da ona görə, caizdir. Hətda Qadı İyad:

«Əvla olan budur. Çünki zidd rəvayətlərin arasını cəm etmək, birini digərinə tərcihdən əvladır.» demişdir. (İbn Rüşd, adı keçən əsər, eyni səhifə)

Bənzər bir ixtilaf da, imamların Küsuf namazında ediləcək qiraətin keyfiyyəti mövzusunda özünü göstərməktədir.

• İmam Malik və Şafi, Küsuf namazında qiraətin gizli ediləcəyini söyləyərkən,

• İmam əbu Yusuf, Muhammməd b. əl-Həsən, imam Əhməd və İshaq b. Rahuye, qiraətin açıqdan ediləcəyi görüşünü mənimsəmişdir.

Onların bu ixtilafının səbəbi, ibn Rüşd'ün də dediyi kimi, bu mövzudakı rəvayətlərin, məna və ifadə tərzi baxımından bir birinə müxalif olmasıdır.

• Təbəri, bu xüsusda da ixtilaflı rəvayətlərin arasını cəm etmə yolunu seçmiş və:

«Küsuf namazı qılan kimsə, muxayyərdir; istəsə qiraəti gizli, istərsə, açıqdan edər.»

demişdir. Dolayısı ilə, bu mövzuda rəvayətlərin arasını cəm etmə caiz və məşrudur.[1]

## 3.3.2. Alimlərin, tualet ehtiyacını görən kimsənin qibləyə önünü və ya arxasını

---

1 *İbn Rüşd, adı keçən əsəri, I, s. 215*

**dönməsinin hökmündəki ixtilafı:**

Bu mövzuda bir çox görüş rəvayət edilmişdir. Əş-Şəvqani bunları 8 maddədə toplamış, ibn Rüşd, 3 maddə halında belə icmal etmişdir:

1. Bir grup, ehtiyacı ödəmək əsnasında -istər böyük tualet, istərsə kiçik tualet ehtiyacını ödəmək olsun- insanın qibləyə önünü və ya arxasını dönməsinin caiz olmadığını söyləmişlərdir.

2. İkinci qrup, bunun mütləq mənada caiz olduğunu söyləmişlərdir.

3. Üçüncü qrup isə, açıq ərazidə ehtiyac ödəyən kimsənin önünü və ya arxasını qibləyə dönməsinin caiz olmadığı, buna qarşılıq, binalarda və şəhərlərdə bunun caiz olduğu görüşünü mənimsəmişdir.

Bu ixtilafın səbəbi, zahirən bir birilə zidd halında olan bir çox hədisin mövcudluğudur.

• Bunlardan biri, əbu Əyyub əl-Ənsari (radiyallahu anh) hədisidir. Buna görə, Peyğəmbər (sallallahu aleyhi və səlləm) belə buyurmuşdur:

Biriniz böyük tualet edəcəyi zaman, qibləyə önünü də, arxasını da dönməsin. Yönünüzü şərqə və ya qərbə çevirin.»

• Bu mövzudakı bir digər rəvayət də, Abdullah b. Ömər (radiyallahu anh)'dan gəlmişdir. Buna görə, o, belə demişdir:

«Bacım Hafsa'nın evinin damına çıxmışdım. Peyğəmbər (sallallahu aleyhi və səlləm)'i gördüm. Ehtiyacını ödəmək üçün, 2 kərpic parçasının üzərində, üzü Şam tərəfinə, arxası qibləyə dönmüş olaraq oturmuşdu.»

İbn Rüşd, bunu açıqlayarkən, bunları söyləyir:

«Alimlər, bu 2 hədisə 3 fərqli şəkildə yanaşmışlardır:

• Bunlardan birincisi: bu zidd rəvayətlərin arasını cəm etmək;

• İkincisi, bunlardan birini digərinə tərcih;

• Üçüncüsü isə, ziddiyyət baş verdiyində, bəraat-ı asliyə'dən rücü etməkdən (yəni hökm verməməkdən) ibarətdir.

«Rəvayətlərin arasını cəm etmə yolunu seçənlər, əbu Əyyub əl-Ənsari (radiyallahu anh) hədisini açıq ərazidə və sütrə (arxasında gizlənəcək örtü, pərdə və s.) mövcud olmayan hallarda ehtiyacı ödəməyə;

İbn Ömər (radiyallahu anh) hədisini isə, sütrənin mövcud olduğu hala həml etmişlərdir. İmam Malik və Şafi'nin məzhəbi də budur. Abbas, Abdullah b. Ömər, Şabi, İshaq -və özündən bu mövzuda gələn 2 rəvayətdən birinə görə- imam Əhməd... və başqaları da bu görüşdədirlər.

Zidd rəvayətlərin birini digərinə tərcih yolunu seçənlər, əbu Əyyub hədisini tərcih etmişlərdir. Çünki biri yeni bir hökm gətirən və digəri hökmün mövcud olmaması şəklindəki əslə uyğun olan 2 rəvayət bəhs mövzusu olduğunda, hansının zaman olaraq daha əvvəl və hansının daha sonra baş verdiyi bilinmirsə, yeni hökm gətirən hədisin tərcih edilməsi gərəkdir.

Bu, Əbu Əyyub, Ömər, Mücahid, Nəxai, Sevri və daha başqalarının görüşüdür.

Ziddiyət halında, əslə rücu (dönməyi) mənimsəyənlərə gəlincə, bu:

«Şübhə, hökmü qaldırır. O mövzuda hökm yoxmuş kimi olur.»

qaydasına bina edilmişdir.

Bu, Davud əz-Zahiri'nin məzhəbidir ki, Urvə b. əz-Zubeyr və imam Malik'in şeyxi Rəbia, bu görüşü mənimsəmişlərdir.

Nəvəvi, Muslim şərhində belə zikr etmişdir. (bax: Nəvəvi, «əl-Minhac», lll, 154, Daru İhyai’t-Turasi’l-Arabi, Beyrut, tarixsiz)

### 3.3.3. Alimlərin, camaatın, imamın arxasında Fatihə oxuması məsələsindəki ixtilafı:

Alimlər, bu mövzuda başlıca 3 görüş halında ixtilaf etmişlərdir:

1. İstər qiraətin açıqdan edildiyi namaz olsun, istər gizli edildiyi namaz olsun, imama tabe olan kimsə, imamla birlikdə fatihəni oxuyar.

Bu, imam Şafi və Əhməd’in ictihadıdır.

2. İmama tabe olan kimsə, heç bir şəkildə fatihəni oxuya bilməz. Qılınan namaz istər imamın açıqdan oxuduğu, istərsə gizli oxuduğu namaz olsun, fərq etməz.

Bu, imam əbu Hənifə’nin ictihadıdır.

3. Camaat, imamın açıqdan qiraət etdiyi namazlarda Fatihəni oxumaz, gizli oxuduğu namazlarda oxuyar.

Bu da imam Malik’in ictihadıdır.

Onların bu mövzuda ixtilaf etməsinin səbəbi, mövzu ilə bağlı nassların ixtilaflı və zidd olmasıdır.

• Onlardan bir qismi, bağlı naslardan birini digərinə tərcih yolunu tutub, camaatın hər halükarda imamın arxasında Fatihəni oxuyacağını söyləyərkən;

• Bir qismi əks istiqamətdəki nassı tərcih edib, camaatın heç bir surətdə Fatihə oxumayacağı görüşünü seçmişlərdir.

• Bir üçüncü qrup isə, bağlı nasların arasını cəm etməyə çalışmış, camaatın, imamın arxasında oxumasını qadağan

edən nassları, imamın açıqdan qiraət etdiyi namazlara, digər nasları da, imamın gizli oxuduğu namazlara həml etmişdir ki, imam Malik və daha başqalarının etdiyi də budur.[1]

Tirmizi, «Sünən»də belə deyir:

«Elm əhli, imamın arxasında qiraət məsələsində ixtilaf etmişdir. Peyğəmbər (sallallahu aleyhi və səlləm)'in səhabələrindən, Tabiundan və onlardan sonra gələnlərdən elm əhlinin çoxu, imamın arxasında qiraət ediləcəyi görüşündədirlər.

Malik, ibnu'l-Mübarək, Şafi, Əhməd və İshaq da bu görüşü mənimsəmişlərdir.»

Abdullah b. Mübarək'in belə dediyi rəvayət edilmişdir:

«Mən imamın arxasında Fatihə oxuyuram. Başqaları da eyni şeyi edir. Sadəcə Kufəlilərdən bir qrup oxumur. Ancaq imamın arxasında oxumayanların namazının da caiz olduğu görüşündəyəm.»[2][3]

---

1 *bax: ibn Rüşd, adı keçən əsəri, I, 157-158*

2 *Mübarəkfuri, «Tuhfətu'l-Əhvəzi şərh-i Camii't-Tirmizi», II, 237-238, Daru'l-Kutubi'l-İlmiyyə, Beyrut, tarixsiz*

3 İmam Tirmizi, müəllifin Tirmizi'dən nəql etdiyi sözlərlə bərabər, bunları da deyir:

«...Əhməd b. Hənbəl'ə gəlincə, «Fatihatu'l-Kitabı oxumayanın namazı yoxdur.» hədisinin mənası:

'Tək başına namaz qıldığında...' deməkdir.» deyir, bu görüşünə də, Cabir b. Abdullah'ın bu sözünü dəlil gətirir:

'Kim ümmü'l-Kitabı oxumadan bir rükət namaz qılarsa, namaz qılmamış deməkdir. Ancaq imamın arxasında olarsa, başqa.'

İmam Əhməd deyir ki:

'Bax, o, Peyğəmbər (sallallahu aleyhi və səlləm)'in səhabələrindən biri olaraq, Peyğəmbər (sallallahu aleyhi və səlləm)'in:

Fatihatu'l-Kitabı oxumayanın namazı yoxdur.' hədisini təvil etmiş və hədisin, insanın tək başına namaz qıldığı zamankı halını anlatdığını bildirmişdir...» (Salat/230)

Mübarəkfuri'nin, Tirmizi'nin «Sünən»inə yazdığı «Tuhfətu'l-Əhvəzi» isimli bu şərhdə (ll, 203), Cabir (radiyallahu anh)'ın bu təvilini «hədisin zahirinə müxalif bir təvil» olaraq dəyərləndirməsi, təəssüb qoxan və Səhabəyə göstərilməsi lazım olan ədəblə üst-üstə düşməyən bir davranışdır.

Hədisin bu şəkildə təvili, Cabir (radiyallahu anh)'a məxsus bir davranış deyildir.

«əl-Binayə» isimli əsərində (ll, 369 və davamı) imam Bədruddin əl-Ayni (əl-Hənəfi), imamın arxasında qiraət edilməyəcəyi rəvayətinin Səhabələrdən 80 nəfərdən nəql edildiyini bildirir. Dolayısı ilə, bu, sadəcə Cabir (radiyallahu anh)'a məxsus bir ictihad deyildir.

Muhamməd Yusuf əl-Bənnuri də, «Məarifu's-Sünən şərh-u Camii't-Tirmizi» (lll, 183 və davamı, Kəraçi, 1414/1992) mövzu ilə bağlı görüşləri, nəqilləri və ixtilafları gözəl bir şəkildə icmal etmişdir.

Səhabədən sonrakı nəsillər içində də, imamın arxasında qiraət edilməyəcəyini söyləyən, ya da ən azından belə edən kimsənin namazının səhih olacağı görüşündə olan bir çox kimsə vardır. Misal olaraq:

Səid b. əl-Musəyyəb; Urvə b. Zübeyr; Səid b. Cubeyr; əz-Zühri; Şabi; Nəxai kimi tabiundan olan imamlar, imamın arxasında qiraət edilməyəcəyi görüşündədirlər.

Hənəfilər xaricində fəqihlərdən:

Sufyan b. Uyeynə; ibn əbi Leyla; əl-Həsən b. Hayy'ın tərcihi də bu yöndədir. (Mövzu haqqında ayrıca bax: ibn Abdi'l-Bərr, «əl-İstizkaru'l-Cami li məzəhibi fuqahai'l-Əmsar və Uləmai'l-Aqtar fi mə tədəmmənəhu'l-Muvatta min Maani'r-Rəy və'l-Asar və şərh-i zəlikə kullihi bi'l-İcaz və'l-İxtisar», lV, 228 və davamı, Abdu'l-Mu'ti Əmin Qalaci təshih və təhqiqi ilə, Muəssəsətu'r-Risalə, Qahirə, 1414/1993)

Hindistandan 2 böyük alim tərəfindən müstəqil olaraq qələmə alınmış 2 əsərdə, imamın arxasında qiraətin hökmü, tərəflərin dəlilləri və xüsusilə Hənəfilərin istinbat tərzi və Quran və Sünnət'dən əsas aldıqları naslar,

İmam ibnu'l-Mübarək, bu məsələdə, bir birini dəstəkləyən dəlillər səbəbilə, zidd nassların arasını cəm etməyə meyl etmiş və mövzu ilə bağlı əmr edici nassları vacibliyə deyil, nədbə (məndubluğa) həml etmişdir. Bu səbəblə, imamın arxasında Fatihə oxumayan kimsənin namazının da cəvazına inanmışdır. Vallahu aləm...

## 3.3.4. Alimlərin, heyvanın heyvanla mübadiləsində riba-i nəsiə cərəyan edib etmədiyi mövzusundakı ixtilafı:

İmam əbu Hənifə, Süfyan əs-Sevri və daha başqaları, heyvanın heyvan müqabilində satışına riba-i nəsiə cərəyan edəcəyini söyləmişdir.

Dolayısı ilə, onlar nəzərində bir qoyunun 2 qoyun qarşılığında ödəniş surətilə satılması caiz deyildir. Onlar bu hökmə Səmurə (radiyallahu anh) hədisiylə istidlal etmişlərdir.

---

təfərrüatlı bir şəkildə ortaya qoyulmuş, məsələnin bütün yönləri böyük bir dirayətlə açıqlanmışdır.

Mövzu ilə maraqlananların bu 2 əsəri mütaliə etmədən hökm bəyan etməsi böyük bir əskiklikdir.

• İlk əsər, imam Kəşmiri'nin: «Məcmu'atu Rəsaili'l-Kəşmiri» (əl-Məclisu'l-İlmi, Kəraçi, 1416/1996) adı ilə nəşr edilən 4 cildlik məcmuə içində (1-ci ciltdə) və «Sələsu Rəsaili'l-Kəşmiri» (Muhamməd Rahmətullah Hafiz təxrici ilə, Daru'l-Bəşəiri'l-İsləmiyyə, Beyrut, 1431/2010) adı ilə nəşr edilən tək cildlik «Faslu'l-Xitab fi Məsələti ummi'l-Kitab» (el-Məclisu'l-İlmi, Kəraçi, 1416/1996)

• İkinci əsər, imam Ləknəvi'nin: «Məcmu'atu Rəsaili'l-Ləknəvi» adı ilə nəşr edilən 6 cildlik məcmuə içində (3-cü ciltdə) yer alan, «İmamu'l-Kəlam fi mə yətə'əlləku bi'l-Qiraəti Xalfə'l-İmam» əsəri ilə, bu əsərə «Ğaysu'l-Ğamam alə imami'l-Kəlam» adı ilə yazdığı haşiyədir.

Buna görə, Peyğəmbər (sallallahu aleyhi və səlləm), heyvanın heyvan müqabilində qarşılığı ödənmək surətilə satılmasını qadağan etmişdir. Bunu Beşlər[1] rəvayət etmiş, Tirmizi və daha başqaları səhih olduğunu söyləmişdir. (Subulu's-Sələm, lll, 53)

İmam Şafi və daha başqaları isə, heyvan alış-satışında faiz cərəyan etməyəcəyi görüşünü mənimsəmişlərdir. Dolayısı ilə onlar nəzərində heyvanların öz cinslərilə arada artıqlıq mövcud olması surətilə satılması caizdir. Onlar da öz görüşlərinə əbu Rafi (radiyallahu anh) hədisi ilə və bu tərz satışın cəvazına dəlalət edən başqa hədislərlə istidlal edirlər. Peyğəmbər (sallallahu aleyhi və səlləm) bir adamdan borc olaraq bir dəvə almış, geri ödənişi isə, 7 yaşında yetişmiş bir dəvə verərək etmişdir.[2]

Bu ixtilafda tərəflərdən hər biri, digərinin dəlillərinə cavab vermişdir. Hənəfilər və bu məsələdə onların yanında yer alanlar, Səmurə (radiyallahu anh) hədisinin, Əbu Rafi (radiyallahu anh) hədisini nəsx etdiyini, dolayısı ilə, Səmurə (radiyallahu anh) hədisinin tərcih edilməsi gərəkdiyini söyləyərlər. Şəvqani də, tahrim (haramlıq) bildirən hədislərin bir birini dəstəklədiyi qənaəti ilə və qadağanlıq bildirən hədislərin mübahlıq bildirilənlərə tərcih edilməsi gərəkdiyini söyləyərək, bu məzhəbi tərcih edir.

İmam Şafi və bu məsələdə onunla eyni qənaəti mənimsəyənlərsə, heyvanın (öz bərabəri olmayan) heyvan qarşılığında, qarşılığının irəlidə ödənilmək surətilə satılmasının caiz olduğunu ifadə edən əbu Rafi (radiyallahu anh) hədisi və bənzəri rəvayətlərlə, bunu qadağan edən Səmurə (radiyallahu

---

1 İbn Həcər, «Büluğu'l-Məram»da, yer verdiyi hədisləri nəql edən imamları qısaca bu təbirlərlə zikr edir:

Üçlər: əbu Davud, Tirmizi, Nəsai;Dörtlər: «Üçlər»lə birlikdə ibn Macə;Beşlər: «Dördlər»lə birlikdə Əhməd b. Hənbəl;Yeddilər: «Beşlər»lə birlikdə Buxari və Muslim

2 *bax: Muvatta, Buyu/42; Muslim, Musakat/118*

anh) hədisinin arasını cəm etməyin mümkün olduğunu söyləyir və belə deyirlər:

«Peyğəmbər (sallallahu aleyhi və səlləm), heyvanın heyvan qarşılığında, qarşılığı irəlidə ödənilmək surətilə satılmasını qadağan etdi.»

tərzindəki Səmurə (radiyallahu anh) hədisində keçən «nəsiə» (alınan şeyin qarşılığını verməyib sonraya saxlamaq) kəliməsi, 2 tərəfin də qarşılığını irəlidə ödəmək surətilə satmasına həml edilir.

Bu halda, o alış-veriş, borcun borcla satışı qəbilindən olur ki, bunun haram olduğu mövzusunda ittifaq vardır. Ancaq burada borcun bir tərəfdə qalması bəhs mövzusudur ki, bu, caizdir. Necə ki, başqa hədislər də bunu ifadə etməkdədir.

Sanani də, imam Şafi'nin etdiyi tərzdə, zidd dəlillərin arasını cəm etməyin mümkün olduğu və qarşı tərəfin nəsx iddiasını isbatlayan açıq bir dəlil mövcud olmadığı gərəkcəsi ilə, bu görüşü mənimsəmişdir.

Əsasən Muslim'in rəvayət etdiyi əbu Rafi (radiyallahu anh) hədisi, hədis hafizlərinin mürsəl oduğu görüşünü mənimsədikləri Səmurə (radiyallahu anh) hədisindən sənəd etibarı ilə daha qüvvətlidir (dolayısı ilə, Səmurə (radiyallahu anh) hədisinin digərini nəsx etdiyini söyləmək doğru deyildir).[1]

Allamə Şəvqani, məsələni və dəlillərini zikr etdikdən sonra belə deyir:

«...Burda -əgər imkan varsa- dəlillərin arasını cəmdən və ya zidlik mövcud olduğunu söyləməkdən başqa yol yoxdur. Şafi'dən nəqlən yuxarıda keçdiyi kimi, bu məsələdə dəlillərin arasını cəm etməyin mümkün olduğu söylənmişdir. Nə var ki, burda cəm, ancaq madumun madumla (yəni alış-satış anında mövcud olmayan 2 şeyin bir biri müqabilində) satışına «nəsiə»

1 *bax: «Subulu's-Sələm», III, 53*

deyilməsinin səhih olmasına bağlıdır.

Əgər ərəb dilində və ya şəri terminalogiyada, madumun madumla satışına «nəsiə» deyildiyi sabitdirsə, məsələ yoxdur. Deyilsə, şübhə yox ki, bu mövzuda qadağalıq bildirən hədislər -hər nə qədər tək başına hər birinin sihhəti haqqında aleyhdə söylənmiş sözlər varsa da- Səhabədən 3 fərqli rəvayət yolu ilə, sabit olmuşdur. Bunlar bir birini dəstəkləyərlər, qüvvətləndirərlər.

Dolayısı ilə, bu rəvayətlər, səhhəti mübahisədən uzaq olmayan bir tək rəvayətə, Abdullah b. Ömər (radiyallahu anh) hədisinə görə, tərcihə daha uyğundur.

Qaldı ki, Tirmizi və ibnu'l-Carud, Səmurə (radiyallahu anh) hədisini təshih etmiş (səhih olduğunu söyləmiş)'dir. Bu da tərcih üçün bir başqa səbəbdir.

...Bu da var ki, Üsul'da sabitləşdiyi kimi, tahrim (haramlıq) bildirən dəlil, ibahə (mübahlıq) bildirən dəlilə tərcih edilir. Və bu da Səmurə (radiyallahu anh) hədisini tərcih üçün, üçüncü bir səbəbdir.

...Səhabədən gələn məvquf rəvayətlərə gəlincə, onlarda dəlil olma özəlliyi yoxdur. Üstəlik, gördüyün kimi onlar da bir biri ilə ixtilaf halındadırlar.» [1]

Mövzu haqqında zikr etdiyimiz bu bir birindən fərqli misallar, düşünmə qabiliyyətinə sahib olanlar üçün, bunu açıqca göstərməktədir:

Nasların arasını cəm etmək və ya birini digərinə tərcih məsələsinin sərhədləri, bir xeyli genişdir və bu mövzu, alimlərin, əhkam istinbatındakı ixtilaf səbəbləri içində ortadan qaldırılması mümkün olmayacaq qədər böyük bir yer işğal etməkdədir.

1 *Şəvqani, «Nəylu'l-Əvtar», V, 232*

İmamlardan hər birini, sabit nasslardan -ki, bunun Quran və ya sünnət nassı olması fərq etməz- hər hansı biri ilə əməli tərk etməkdən tənzih edərik. Belə bir tərk, ancaq o imam nəzdində bir nassı buraxıb digərini almağı gərəkdirən ziddiyyət hallarında bəhs mövzusu olur. Bu da ancaq, bəhs mövzusu nasların arasını cəm etməyin və aralarını birləşdirməyin imkansızlığı halında ortaya çıxır. Bu, Sələfdən və sonrakılardan müctəhid imamlarla tənqid və təhqiq əhli alimlərin üzərində icma etdiyi bir xüsusdur...

## 3.4. Üsul qaydalarındakı və bəzi istinbat qaynaqlarındakı ixtilaf:

Fəqihlərin ixtilafına qaynaqlıq edən dördüncü səbəb, bəzi üsul qaydalarındakı və bəzi istinbat qaynaqlarındakı fərqliliklərdir.

Elm əhli tərəfindən qəbul və etiraf edilən bir xüsusdur ki, bəzi ictihad üsul və qaynaqları, müctəhid alimlər arasında ixtilaflıdır.

• Digər imamlardan fərqli olaraq imam Malik (rahiməhullah)'ın, Mədinə əhlinin əməlini dəlil qəbul etməsi;

• Çoxluq əməl etməsinə baxmayaraq Hənəfilərin «məfhum-u müxaləfət»lə[1] əməli tərk etməsi;

• Yenə Hənəfilərin amm (ləfzin lüğət olaraq, əhatə dairəsinə

---

1 Məfhum-u müxaləfət: Dəlilin sükut keçdiyi xüsusun (məskutun anh'ın), dəlildə dilə gətirilənə (mantuq olan şeyə) müxalif olması halıdır. Məsələn:

'Alimlərə hörmət etmək lazımdır.' deyildiyində, bu sözlərdən, cahillərə hörmət etmək gərəkmədiyi anlaşılır.

Məfhum-u müxalifətin:

məfhum-u sifət; məfhum-u şərt; məfhum-u qayə; məfhum-u ədəd kimi növləri vardır.

girən bütün fərdləri hər hansı bir ayırma və xüsusi bildirmə olmadan içinə alması) ifadənin xass'a (bir tək istifadə ilə tək bir mənanı ifadə etmək üzərə olan ləfzə) və mütləqin (qeyr-i müəyyən bir fərdi və ya fərdləri göstərən və ya hər hansı bir sifətlə məhdudlaşmış olmayan ləfzin) muqayyədə (qeyri müəyyən bir fərdi və ya fərdləri göstərən və ya hər hansı bir sifətlə məhdudlaşmış olan ləfzə) həmli imkanına müxalifəti; və

- Ravi rəvayət etdiyi hədisin xilafına əməl etdiyində, rəvayətin deyil, ravinin əməlinin əsas alınması gərəkdiyini söyləməsi...

kimi Üsul qaydaları, bunun nümunələrini təşkil edir.

Əhəmiyyəti və fəqihlərin ixtilafında dərin təsirləri mövcud olması səbəbilə, günümüzdə elmi tədqiqatçılar, bu səbəbə xüsusi bir diqqət göstərməktədirlər. Hətta Əzhər universitetində maqistr təhsilindən məsul olan qurumlar, fiqh üsulu bölməsində «Üsul qaydalarının fəqihlərin ixtilafındakı rolu» başlıqlı bir dərs oxudulması qərarını aldı.

Professor Dr. Mustafa əl-Hinn də, doktorantura diplom işini, bu mövzuda yazmışdır. Bu, fəqihlərin ixtilafı mövzusunda araşdırma edənlər üçün, baş vurulacaq qaynaq olması yönündən, yeni bir çalışmadır.

Burda, bu səbəbin, fəqihlərin ixtilafına təsirini açıqlığa qovuşduran misallardan əhəmiyyətli gördüyümüz bir neçəsini zikr etməklə kifayətlənəcəyik:

### 3.4.1. Mədinəlilərin əməlinin dəlil olub olmadığı mövzusundakı ixtilaf:

İmam Malik, Mədinəlilərcə hər hansı bir məsələdə üzərində görüş birliyi edilmiş əməli, şəri əhkam mövzusunda özü ilə

istidlal edilən (dəlil olaraq istifadə edilən) qüvvətli bir hüccət olaraq görür. O, Mədinəlilərin icmasını dəlil qəbul edən metodunu müdafiə sədədində, Misir fəqihi- Leys b. Sa'd'a göndərdiyi məktubda belə demişdir:

«Allah Taala, Kitabında belə buyurmuşdur:

'---Dində hamını ötüb keçən ilk mühacirlərə və ənsarlara, həmçinin yaxşı işlər görməkdə onların ardınca gedənlərə gəlincə, Allah onlardan razıdır, onlar da Ondan razıdırlar. Allah onlar üçün ağacları altından çaylar axan, içində əbədi qalacaqları Cənnət bağları hazırlamışdır. Bu, böyük uğurdur.---' (Tövbə/100)

...insanlar ancaq Mədinəlilərə tabedirlər. Hicrət bura olmuş, Quran burda nazil olmuş, halal və haram burda təşri qılınmışdır. Peyğəmbər (sallallahu aleyhi və səlləm), onların arasında yaşamışdır. Onlar vəhyin enişinə şahidlik etmişlərdir. Vəhy (alan Peyğəmbər) onlara əmr etmiş, onlar da itaət etmişlərdir. O, onlara sünnət və qanun qoymuş, onlar da Ona tabe olmuşlardır. Allah Taala, Onun üçün, Öz uca qatında olanı tərcih edib Onu dünyadan alana qədər (Allahın salatı, salamı, rəhməti və bərəkəti Onun üzərinə olsun) hal, bu minval üzərə davam etmişdir.

...Ondan sonra ümmətin işini yüklənənlərdən, ümmət içində Ona ən çox tabe olanlar iş başına keçdilər. Qarşılaşdıqları hadisələr içində hökmünü bildiklərini, bildikləri kimi icra etdilər, hökmünü bilmədikləri xüsusları da, bilənlərdən soruşdular və öz ictihadları və Peyğəmbər (sallallahu aleyhi və səlləm)'ə yaxın olmağın təmin etdiyi qabiliyyət doğrultusunda, dəlili ən qüvvətli olanı tərcih edərək tətbiq etdilər.

Hər hansı biri onlara müxalifət edib:

'...sizin tərcih etmədiyiniz hökm, dəlili daha qüvvətli və əsas alınmağa daha əlverişlidir.' demiş olsalar belə, onun görüşü

tərk edildi və o biri hökmlə əməl edildi.

'...onlardan sonra Tabiun gəldi. Onlar da bu yolu tutdular, o tətbiqata tabe oldular.

Dolayısı ilə, hər hansı bir iş, Mədinədə zahir olub özü ilə əməl edildiyi zaman, heç kimin ona müxalifət etməsini uyğun görmürəm. Çünki bəhsini etdiyim miras, Mədinə əhlinin əlindədir. O miras ki, (Mədinəlilər xaricində) heç kimin onu sahiblənməsi və özünə aid olduğunu iddia etməsi caiz deyildir...»[1]

Alimlərin çoxu, imam Malikin bu ihticacına (Mədinə əhlinin əməlini bağlayıcı bir dəlil olaraq görməsinə) müxalifət etmiş, icmanı, hər hansı müəyyən bir şəhərə təxsis etmədən, bütün alimlərin söz birliyi olaraq etibara almışlardır. Bu mövzunun təfsilatı, üsul kitablarının, məsələyə bağlı bölmələrində mövcuddur...[2]

### 3.4.1.1. İmam Malik, -əmi, dayı kimi- zəvi'l-ərhamın[3] mirasdan pay almayacağı görüşündədir. Bunun səbəbi, Mədinəlilərin zəvi'l-ərhama mirasdan pay verməməsidir.

Bu məsələdə, Hənəfilər, Hənbəlilər və daha başqaları,

1 Bu məktubun tam mətni, imam Leys'in cavabı ilə birlikdə bu kitabın sonunda «Alimlərin bir birilərinə qarşı göstərdikləri ədəbdən nümunələr» başlıqlı xüsusi bölmədə gələcəkdir.

2 *nümunə üçün bax: əl-Amidi, «əl-İhkam fi usuli'l-Əhkam», I, 349, Matbaatu'l-Maarif, Misir, 1332/1913*

3 Zəvi'l-ərham- zi rahm'ın cəm halıdır. Lüğətdə: «mütləq yaxın/əqrəba» mənasındadır. Terminalogiyada: «ölən kimsənin geridə miras olaraq buraxdığı mallarda, müəyyən bir payı olmayan bir yaxın» deməkdir.

Zəvi'l-ərham, ancaq, ashab-ı fəraiz'dən (fərz hissə sahibi) və asabədən (bəlli bir payı olmayıb ölənin miras olaraq buraxdığı mallardan artıq qalanı almağa haqq qazanan, ata tərəfindən qohum-əqrəba) kimsə olmadığı təqdirdə, mirasdan pay almağa haqq qazanır.

onlara müxalifət edərək, mirasın paylaşdırılması tərzi üzərə, aralarında təfsilə gedərək, zəvi'l-ərhamın da mirasdan pay alması gərəkdiyi görüşünü mənimsəmişdirlər.

Onlar:

«---Qohumlar Allahın Kitabına görə bir-birinə varis olmağa daha yaxındırlar. Həqiqətən, Allah hər şeyi bilir.» (Ənfal/75)

ayətində keçən, 'ulu'l-ərham' (qohumlar) təbirinin ümum ifadəsindən hərəkətlə, bu nəticəyə varmışlardır.

Bir digər dəlilləri, imam Əhməd və daha başqalarının əbu Umamə b. Səhl (radiyallahu anh)'ın nəql etdiyi bu rəvayətdir:

«Ömər (radiyallahu anh), əbu Ubeydə (radiyallahu anh)'a yazdığı məktubda belə dedi:

'Allah və Rəsulu, məvlası (vəlisi, qoruyucusu) olmayanın məvlasıdır; dayı da, varisi olmayan kimsənin varisidir.»

Bu, hafiz ibn Həcər'in də «Büluğu'l-Məram»da açıqca ifadə etdiyi kimi, Tirmizi'nin həsən, ibn Hibban'ın isə, səhih olduğunu söylədiyi bir rəvayətdir. [1]

İmam Malik, bu məsələ ilə bağlı ictihadına dəlil gətirmə sədədində belə deyir:

«Bizim qatımızda, üzərində birləşilən, haqqında ixtilaf baş verməyən və bölgəmizdəki elm əhlindən mənim yetişdiyim kimsələrin mənimsədiyi hökm budur:

- Ana bir qardaşın oğlu;
- Ananın atası olan baba;
- Atanın ana bir qardaşı olan əmi, dayı;
- Ananın atasının anası olan nənə;

---

1 *Sübulu's-Səlam, III, 131*

- Ana-ata bir qardaşın qızı;
- Xala və bibi

bu qohum-əqrəbalıq münasibəti səbəbilə[1], heç bir şəkildə mirasdan pay ala bilməzlər...»[2].

### 3.4.1.2. Yenə bu əslə (Mədinə əhlinin əməlinə) dayanaraq, imam Malik'ə görə, Bayram namazlarında birinci rükətdə, qiraətdən əvvəl alınacaq təkbirlərin sayı -iftitah təkbiri ilə birlikdə- 7, ikinci rükətdə isə -səcdədən qalxarkən alınan təkbirlə birlikdə- 6'dır.

İmam Malik, bu görüşünə, ibn Ömər (radiyallahu anh)'dan nəql etdiyi bu rəvayəti dəlil gətirmişdir:

«Qurban və Ramazan bayramlarını, əbu Hureyrə (radiyallahu anh) ilə birlikdə idrak etdim. Namaz(lar)ın ilk rükətində, qiraətdən öncə 7, ikinci rükətində isə, qiraətdən əvvəl 5 təkbir aldı.»

Malikin bu ictihadında dayandığı ikinci dəlil isə, Mədinəlilərin bu mövzudakı əməlidir... [3]

---

1 İmam Malikə görə, miras qoyan kimsənin, yuxarıda sayılanlar xaricində qohum-əqrəbası olmasa belə, onlar, mirasdan pay ala bilməzlər. Belə bir halda, miras, beytu'l-mala qalır. (bax: Zurqani, «Şərhu'l-Muvatta», II, 38, Daru'l-Kutubu'l-İlmiyyə, Beyrut, 1411/1990)

2 *Malik, b. Ənəs, «Muvatta», I, 518, Muhammməd Fuad Abdulbaqi təhqiqi ilə*

3 *İbn Rüşd, «Bidayətu'l-Müctəhid və Nihayətu'l-Muqtəsid», Məktəbətu'l-Kulliyyəti'l-Əzhəriyyə, 1386/1966*

## 3.4.1.3. Yenə imam Malik, rada (süd əmmə) mövzusunda, Aişə (radiyallahu anha)'dan belə bir rəvayət nəql edir:

«Endirilən Quran cümləsindən olaraq, məlum olan 10 haram qılan əmmə (hökmünü gətirən ayət) var idi. Sonra məlum 5 əmmə (hökmü gətirən ayət ilə) nəsx edildi. Allah rəsulu (sallallahu aleyhi və səlləm) vəfat etdiyində, o (5 dəfə süd əmməyin süd qohumluğu meydana gətirəcəyi ayəti) Quran zimnində (açıqca olmayıb, dolayısı ilə üstü qapalı olaraq içində var olan) oxunub təkrarlanırdı.»

«əl-Muvatta ravisi Yəhya dedi ki: Malik belə dedi:

'Əməl, bu rəvayətin bildirdiyi kimi deyildir.»[1]

Bu səbəblə Malik, süd əmməyin azının da, çoxunun da -hər hansı bir təhdid (məhdudlaşdırma) bəhs mövzusu olmadan-haram qılınacağını söyləmişdir. [2]

## 3.4.1.4. Bununla bərabər, ağacdan meyvə satışında, meyvənin bir qismini istisna etmə mövzusunda, imam Malik belə deyir:

«Bizdə üzərində görüş birliyi edilmiş olan hökm budur:

Bir kimsə, baxçasının meyvəsini satdığı zaman, meyvələrin 1/3-nə qədər olan qismini satışdan istisna edə bilər. Ancaq bu miqdarı aşa bilməz. Bunun altındakı nisbətin istisna edilməsində bir beis yoxdur...»[3]

Muvattada bunun kimi misallar çoxdur.

---

1 *Muvatta, «Rada», 3*
2 *«Bidayətu'l-Müctəhid», II, 38*
3 *Muvatta, Buyu, 11*

## 3.4.2. Məfhum-u müxaləfətin dəlil olub-olmadığı mövzusundakı ixtilaf:

Üsulçulara görə, «məfhum-u müxaləfət», mantuqun hökmünün ziddinin, sükut keçilən məsələ haqqında sabit olduğuna, ləfzin dəlalət etməsidir.

əl-Amidi, onu belə tərif edir:

«Ləfzin sükut keçilən şeyə dəlalətinin, zikr edilənə dəlalətinin əks istiqamətdə olmasıdır.» [1]

Üsul kitablarında açıqlanan bir çox qisim və növləri olan məfhum-u müxaləfətə misal olaraq, Peyğəmbər (sallallahu aleyhi və səlləm)'in:

«Varlının öz borcunu gecikdirməsi, zülümdür.»[2] hədisidir.

Bu hədisin məfhum-u müxalifindən, ödəmə imkanı olmayan kimsənin borcunu gecikdirməsinin, zülüm sayılmayacağı nəticəsi çıxar.

Alimlər, şəri nassın müxalif məfhumu ilə ihticac etməyin (dəlil olaraq istifadə etməyin) səhih olub olmaycağı məsələsində, başlıca 2 görüş halında ixtilaf etmişlərdir:

Çoxluğu təşkil edənlər, müəyyən şərtlər çərçivəsində, müxalif məfhumun dəlil olaraq istifadə edilə biləcəyini, Hənəfilərlə daha başqa bir qisim alimlər isə, Şari'in (şəriəti göndərən, qanun qoyan Allah'ın) sözündə, müxalif məfhumun dəlil olaraq istifadə edilməyə əlverişli olmadığını söyləmişlərdir. [3]

---

1 *əl-Amidi, «əl-İhkam», III, 99*

2 *Buxari, «Havalat», 1; Muslim, «Musakat», 33*

3 Müəllifin burda keçən «Şari'in sözü» qeydinin də ifadə etdiyi kimi, Hənəfilər, müxalif məfhumu, ayət və hədislər kontekstində işlətməməkdə, bunun əvəzinə, insanlar arasında cari olan davranışlarda istifadə edilən ifadələr kontekstində bu prinsipə etibar etməktədirlər. (bax: Mustafa Səid əl-Hinn, «Əsəru'l-İxtilaf fi'l-Qavaidi'l-Usuliyyə fi ixtilafi'l-fuqaha», Muəssəsətu'r-Risalə,

Fiqhin fəri məsələlərində, bu əsldəki ayrılıqdan qaynaqlanan geniş bir ixtilaf sahəsi meydana gəlmişdir. Bir neçə misal zikr edəcək olarsaq:

### 3.4.2.1 Alimlərin, aşılanmadan əvvəl satılan xurmanın hökmü mövzusundakı ixtilafı:

Bu mövzuda, ibn Ömər (radiyallahu anh)'dan gələn bir rəvayətdə, Peyğəmbər (sallallahu aleyhi və salləm) belə buyurmuşdur:

«Kim aşılandıqdan sonra bir xurmalıq satın alsa, özü əksinə bir şərt qoşmadıqca, o xurmalığın meyvəsi, satana aiddir.» [1]Hədis, muttəfəqun aleyhdir.[2]

Bir çox alim, bu hədisin mantuqunu əsas alaraq, satın alan kimsə, əksinə bir şərt qoşmadıqca, aşılanmadan sonrakı məhsulun satana, məfhum-u müxalifi əsas alaraq da aşılanmadan əvvəlki məhsulun müştəriyə aid olduğunu söyləmişdir.

Hənəfilər isə -məfhum-u müxaləfətlə əməl edilməyəcəyi şəklindəki qaydalarına əsasən- belə deyirlər:

Müştəri, əksini şərt qoşmadıqca, məhsul, aşılanmadan əvvəl də, sonra sa satana aiddir.

### 3.4.2.2. Bu çərçivədəki ixtilaflara bir digər misal da, bir kimsənin azad bir qadınla evlənə biləcək halda olduğu halda, kitabi (əhl-i kitaba mənsub) və ya müsəlman bir cariyə ilə evlənməsinin hökmüdür.

1 *Subulu's-Səlam, lll, 63*
2 *Buxari, Buyu/90; Muslim, Buyu/77*

Çoxluq, cariyə ilə evlənə bilməyin caizliyini, azad qadınla evlənməyə imkan edə bilməmək şərtinə bağlıdır demişlərdir. Onlar bu hökmə:

«---Sizlərdən hər kəs maddi imkanı olmadığına görə azad mömin qadınlarla evlənə bilmirsə, onda sahib olduğu mömin kənizlərdən alsın...---» (Nisa/25)

ayətinin müxalif məfhumunu əsas alaraq varmışlardır.

Hənəfilərsə, yuxarıda zikr etdiyimiz əsllərə dayanaraq, azad qadınla evlənməyə gücü yetənlərin də, cariyələrlə evlənməsinin caiz olduğuna hökm etmişlərdir.

Allamə Alusi, Ruhu’l-Maani təfsirində, bu məsələni açıqlayarkən, bunları deyir:

«Ayətin zahiri, azad qadınlarla evlənməyə gücü çatan kimsələrin -məfhum-u şərt gərəyi- cariyələrlə evlənməsinin caiz olmadığını ifadə etməktədir. Necə ki, bu, imam Şafi’nin görüşüdür.

Yenə ayətin zahiri, kitabi cariyələrlə evlənməyin -məfhum-u sifət gərəyi- mütləq surətdə, caiz olmadığını göstərməktədir ki, bu da, Hicazlıların görüşüdür.

İmam əbu Hənifə (rahiməhullah) isə:

«Sizə halal olan başqa qadınlardan...» (Nisa/3) və «Bunlar xaricində qalanlar isə... sizə halal qılındı.» (Nisa/24)

ayətlərinin mütləq gərəyi səbəbilə, hər 2 sinif cariyə ilə də evlənməyin caiz olduğunu söyləmişdir. Ona görə, təxsis (xas qılma) gərəkdirən bir dəlil olmadıqca, heç bir şey, bu ayətlərdəki mütləq ifadənin xaricinə çıxarıla bilməz. Müxalifləri tərəfindən zikr edilənlər içində, bu mütləq ifadənin xaricinə çıxıla biləcəyini göstərən güclü bir dəlil mövcud deyildir.

...ilk əvvəl üsulda sabit olduğu kimi, 2 məfhum -yəni

məfhum-u şərt və məfhum-u sifət-[1], Allah ondan razı olsun, əbu Hənifə nəzərində hüccət deyildir...» [2]

Bu ixtilafdan qaynaqlanan daha başqa misallar da mövcuddur...

Burda bir xüsusa işarət etməyimiz də yerində olacaqdır:

Alimlərin üzərində ittifaq etdiyi bir çox hökmlər vardır ki, bunlardan bir qismində bəzi alimlərin dəlili, məfhum-u müxaləfətdir. Bu dəlildən hərəkət edərək, bir hökmə varanlarla, Hənəfilərin hökmünün ittifaq etmiş olması, Hənəfilərin öz özləriylə ziddiyyətə düşərək məfhum-u müxaləfətlə əməl etdiyi zənninə yol açmamalıdır. Hal, belə deyildir.

Onların digərlərilə ittifaq təşkil edən görüşü, məfhum-u müxaləfətdən deyil, o mövzuda etimad etdikləri -bəraət-i əsliyyə [3]kimi - bir başqa dəlildən qaynaqlanmaqdadır.

---

1 Məfhum-u sifət:

Hökmü, bir vəsflə məhdudlaşdırılmış olan nassın, bu vəsfi daşımayan hallar haqqında, o hökmün məqbul olmadığına dəlalət etməsidir.

Məsələn, Peyğəmbər (sallallahu aleyhu və səlləm)'in:

«Varlının (imkanı olan kimsənin), borclu olduğu kimsəni gecikdirməsi, zülümdür. Onun şikayət edilməsi və cəzalandırılması, halaldır.» (fərqli ləfzlərlə, bax: Buxari, «İstiqraz və ədəbu'd-duyun»,12; Əbu Davud, «Buyu», 10) hədisi, mantuquyla, borcunu ödəmə imkanına sahib olan kimsənin, öz borcunu ödəməkdən uzaq durmasının zülüm sayıldığını, bu təqdirdə, borc sahibinin şikayət edərək hakimin onu cəzalandırmasını istəməsinin caiz olduğunu, məfhum-u müxalifi (zidd mənası) isə, kasıbın borcunu ödəməməsinin zülüm olmadığını ifadə etməkdədir. Çünki mantuqun hökmü «imkanı olma» vəsfi ilə məhdudlaşmışdır. Bu özəllik mövcud olmayınca, hökm də olmaz.

Məfhum-u şərt:

Hökmü, şərt ədatlarından biri ilə müəyyən bir şərtə bağlanmış olan nassın, o şərtin yoxluğu halında bəhs mövzusu hökmün məqbul olmadığına dəlalət etməsidir.

2 *Alusi, «Ruhu'l-Maani», V, 8*

3 Bəraət-i əsliyyə:

Bunun misallarından biri, axırda bəslənən qoyunlardan zəkat vermə vəzifəsinin mövcud olmamasıdır. Hənəfilər bu hökmə:

«Saimədə (ilin əksər vaxtlarını otlaqlarda otlayaraq keçirən dəvə, öküz, qoyun kimi heyvanlarda) 1/40 zəkat vardır.» (Buxari, Zəkat/37)

hədisinin məfhum-u müxalifi ilə çatmış deyillərdir.

Hənəfilər bu hökmə, «əsli yoxluq» prinsipi üzərindən çatmışlardır. Çünki əsl olan (xüsusi bir dəlil mövcud olmadıqca), zəkatın vacib olmamasıdır.

Yuxarıdakı hədisin nassı isə, saimə heyvanlar üçün, zəkat mükəlləfiyəti gətirməktədir. Belə olduğu halda, axırda bəslənən heyvanlar üçün, zəkat mükəlləfiyyəti -bu əsl doğrultusunda- mövcud olmaması şəklindəki hökm, daimi qalır. [1]

## 3.5. Ziddiyyət halında, amm nassın, xas nassa həmlindəki ixtilafları:

Alimlər, ziddiyyət halında amm nassın, xas nassa həml edilib-edilməyəcəyi mövzusunda ixtilaf etmişlərdir. Bu ixtilaf, amm nasların dəlaləti mövzusunda, alimlər arasında mövcud olan ixtilafa dayanmaqdadır.

Çoxluğu təşkil edən alimlər:

«Amm ləfzin dəlaləti zimnidir.»

deyərkən, Hənəfilər, ammın dəlalətinin, qəti olduğu görüşündədirlər.

---

Fiqh üsulunda, «İnsanın, Şari’nin hökmü olmadan mükəlləf tutulmaması» mənasında istifadə edilən bir termindir.

1 *əl-Hinn, «Əsəru’l-İxtilaf», 173; Mahlavi, «Təshilu’l-Vusul», 115*

Bu səbəblə, əksər alimlər, amm ləfzi, xassa həml etmiş və xas ləfzlə, dəlalət etdiyi xüsusda əməl edərkən, geridə qalan xüsuslarda, amm ləfzlə əməl etmişlərdir.

Hənəfilərə gəlincə, zidd olduqlarında, zaman olaraq hansının əvvəl, hansının sonra olduğu bilinmirsə, amm ləfzi, xas üzərinə həml etmiş, aralarını cəm etmək mümkün deyilsə, bu ikisinə 2 zidd dəlil olaraq etibar edib, tərcih yollarından hansıyla olarsa, onu işlədərək onlardan birini tərcih yoluna getmişlərdir.

Fər'i məsələlərdə, bu əsldəki ayrılıqdan qaynaqlanan geniş bir ixtilaf sahəsi mövcuddur. Bir neçə nümunə zikr edəcək olarsaq:

### 3.5.1. Torpaq növlərinin zəkat nisabındakı ixtilaf:

Əksəriyyəti təşkil edən alimlər, torpaq növlərinin zəkat nisabının 5 vesq -1000 kq- olduğunu söyləmişlərdir. Buna da əbu Səid əl-Xudri (radiyallahu anh)'ın rəvayət etdiyi:

«5 vesqdən aşağısına zəkat yoxdur.» (Buxari, Zəkat/31)

hədisini dəlil gətirmişlərdir.

Əksər alimlər, bu hədisin:

«Göyün və ya dərələrin suladığı yaxud kökləri ilə suyu tapan (məhsullara) da öşr vardır. Alətlə sulananlarda, öşrün yarısı vardır.» [1]

hədisinin ümum ifadəsini təxsis etdiyini (xas qıldığını) söyləyirlər.

İmam əbu Hənifə isə, az olsun, çox olsun, torpaqdan çıxan şeylərdə, zəkatın fərz olduğunu söyləmiş və bu görüşünə:

---

1 *Buxari, Zəkat/54*

«Göyün və ya dərələrin suladığı...» hədisini dəlil gətirmişdir. O, bu rəvayəti:

«5 vesqdən aşağısına zəkat yoxdur.»

hədisi ilə təxsis etməmiş, bu xas hədisi, ticarət mallarında zəkatı bildirdiyi şəklində təvil etmişdir.

İmam Səraxsi, «əl-Məbsut»da belə deyir:

«Əbu Hənifə:

'Bu hədisin təvili, ticarətdə zəkatın qəsd edildiyi şəklindədir. Onlar (səhabələr), hədisdə gəldiyi kimi, vesqlərlə ticarət edərlərdi. 5 vesqin qiyməti, 200 dirhəmdir.»[1]

## 3.5.2. Müsəlmanın, zimmi kafirə qarşı öldürülüb-öldürülməyəcəyi mövzusundakı ixtilaf:

Əksər alimlər, bir neçə dəlildən hərəkət edərək, müsəlmanın zimmi kafirə qarşılıq öldürülməyəcəyini söyləmişdir ki, dəlillərdən bəziləri bunlardır:

1. Əbu Cuhayfə (radiyallahu anh) belə rəvayət etmişdir:

«Əli (radiyallahu anh)'a:

'Sizin yanınızda Quran xaricində bir vəhy var mı?' diyə soruşdum. Belə dedi:

'-Xeyr. Toxumu çatladan və canı yaradan Allaha and olsun ki, Allahın bir adama Quran mövzusunda bəxş etdiyi anlayış ilə bu səhifədə mövcud olandan başqa bir şey yoxdur.'

'-Bu səhifədə nə var?' dedim.

1 *«əl-Məbsut», III, 3, Daru'l-Fikr, Beyrut, 1409/1989*

-’Diyet, əsiri sərbəst buraxmaq və kafirə qarşılıq müsəlmanın öldürülməyəcəyi (nə dair hökmlər).» diyə cavab verdi.» [1]

2. Əli (radiyallahu anh)’dan rəvayət edildiyinə görə, Allah rəsulu (sallallahu aleyhi və sələm) belə buyurmuşdur:

«Möminlərin qanları bir birinə bərabərdir. Onlar, başqalarının üstündə (adil və qüdrətli) bir əl (kimi)’dir. Onların ən zəifi belə, Müsəlmanların zimməti ilə səy edər. Diqqət edin! Heç bir mömin bir kafirə qarşılıq öldürülməz! Heç bir əhd sahibi (zimmi) də, əhdi davam etdiyi müddətcə, öldürülməz.» [2]

Əksər alimlər, bu hədislərin:

• «Ey iman edənlər! Öldürülənlər mövzusunda sizə qisas fərz qılındı.» (Bəqərə/187)

• «Kim haqsız yerə öldürülərsə, biz onun vəlisinə ixtiyar vermişik. O da (qisas yolu ilə) öldürmədə həddi aşmasın.» (İsra/33)

• «Biz Tövrat’da onlar üzərinə belə yazmışdıq:

Cana can...» (Maidə/45)

kimi ümum ifadəli ayətləri təxsis etdiyini söyləmişlərdir.

İmam əbu Hənifə isə, müsəlmanın zimmi kafirə qarşı öldürüləcəyini söyləmiş, bu ictihadına da yuxarıdakı ayətlərin ümum ifadələrini dəlil gətirmişdir. O, bu ayətlərin yuxarıda keçən hədislərlə təxsisinə getməmiş, hədisdə varid olan «kafir» kəliməsini «hərbi kafirə» həml etmişdir. Buna da rəvayətdə keçən:

«Heç bir mömin, bir kafirə qarşılıq öldürülməz! Heç bir əhd sahibi (zimmi) də, əhdi davam etdiyi müddətcə öldürülməz.» ifadəsini dəlil göstərmişdir.

1 *Buxari, Elm/39; Cihad/168*

2 *Əhməd b. Hənbəl, I, 119*

## 3.6. Mütləqin muqayyədə həmli mövzusundakı ixtilaf:

Eyni şəkildə alimlər, mütləq ifadəli nassın, muqayyəd nassa həml edilib-edilməyəcəyində də ixtilaf etmişlərdir. Burdakı ixtilaf, amm nassın, xas nassa həmlindəki ixtilafa bənzəməktədir.

Əksər alimlər, Üsul kitablarında bildirilən şərtlər doğrultsunda, mütləq nassın, muqayyəd nassa həml ediləcəyini söyləyərkən, Hənəfilər onlara müxalifət edərək, mütləqin muqayyədə həml edilməyəcəyini söyləmişlərdir. (Bu mövzunun təfsili üçün, Mahlavi'nin, «Təshilu'l-Vusul ilə ilmu'l-usul»una baxıla bilər).

Füruya dair bir çox ixtilaf, bu əsldəki ixtilafdan meydana gəlməktədir. Buna dair bir neçə nümunə zikr edək:

### 3.6.1. Kişi ilə qadın arasında nigah haramlığı meydana gətirən süd əmmə (rada)'nın ədədi mövzusundakı ixtilaf:

İmam əbu Hənifə və başqa bir neçə alim, istər az, istər çox əmilsin, radanın haramlıq doğuracağını söyləmiş və bu görüşlərinə:

«Sizi əmzirən analarınızın...» (Nisa/23) ayəti ilə:

«Soy-nəsəb cəhəti ilə haram olan, rada cəhətilə də haram olur...»[1]

bəzi hədislərin mütləq ifadəsini dəlil göstərmişlərdir.

Bunların bütünü, radanı, hər hansı müəyyən bir sayı ilə məhdudlaşdırmayan mütləq ifadəli nasslardır.

1 *Buxari, Şəhadat/7; Muslim, Rada/2*

İmam Şafi ilə özündən gələn bir rəvayətdə, imam Əhməd isə, Aişə (radiyallahu anha)'dan gələn bu hədis ilə istidlal edərək, radada ancaq 5 dəfə əmməyin haramlıq doğuracağını söyləmişlərdir:

«Qurandan endirilənlər cümləsindən olaraq: məlum 10 dəfə əmmək, nigah haramlığı doğurur» (ayəti) vardı. Sonra bunlar, bilinən 5 dəfə (əmmə ayəti ilə) nəsx edildi. Allah rəsulu (sallallahu aleyhi və səlləm), bu ayət oxunan Quran meyanında ikən vəfat etdi.» [1]

Onların dəlil aldığı bir digər hədis də, yenə Aişə (radiyallahu anha)'dan gələn:

«Səhlə, Salimi 5 dəfə əmizdirdi...» (Subulu's-Səlam, lll, 281) rəvayətidir.

Onlar, mütləqin muqayyədə həml ediləcəyi şəklindəki qaydaları ilə əməl edərək, zikr edilən mütləq ifadəli ayət və hədisləri, süd əmməni müəyyən bir sayı ilə təqyid edən (məhdudlaşdıran) bu hədislərə həml etmişlərdir.

İmam əbu Hənifə isə, mütləqin muqayyədə həml edilməyəcəyi şəklindəki qaydasına dayanaraq, belə bir həmlə getməmişdir. Bu məsələ də, geniş bir ixtilaf sahəsi meydana gətirmişdir. Mövzunun təfsilatı üçün Xilafiyyat kitablarına baxılmalıdır.[2]

### 3.6.2. Zihar kəffarətində azad ediləcək qulun mömin olmasını şərt qoşmağın hökmü mövzusundakı ixtilaf:

---

1 *Muslim, Rada/24; əbu Davud, Nikah/11; Tirmizi, Rada/4*

2 *Əbu'l-Fərəc ibnu'l-Cevzi, «ət-Tahqiq», lX, 231 və davamı; ibnu'l-Munzir, «əl-İşraf», V, 117 və davamı; ibn Fərah, «Muxtasaru Xilafiyyati'l-Beyhaqi», lV, 303 və davamı*

Alimlər, zihar kəffarətində azad ediləcək qulun, mömin olmasının şərt olub-olmamasında ixtilaf etmişlərdir. Əksəriyyət alimlər, əl-Mücadilə surəsindəki:

«---Zihar edərək (qadınlarını anaya bənzədərək özlərinə haram edib) ayrılıb, sonra sözlərini geri götürənlər onlarla yaxınlıq etməzdən əvvəl bir kölə azad etməlidirlər.---» (Mücadilə/3)

ayətindəki mütləq ifadəni, Nisa surəsindəki:

«---Kim bir mömini xəta ilə öldürərsə, (onun cəzası) bir mömin kölə (qul) azad etməkdir...» (Nisa/92)

ayətindəki təqyidə (azad ediləcək kölənin mömin olması gərəkdiyi şəklindəki qeydə, məhdudlaşdırmağa) həml edərək, zihar kəffarətində azad ediləcək qulun da mömin olması gərəkdiyini söyləmişdir.

Çünki hər nə qədər ayrı-ayrı mövzularda varid olmuş olsalar da, bu 2 ayət arasında bir hökm birliyi vardır:

Qul azad etmək. Bu səbəblə əksəriyyəti təşkil edən alimlər, burda da mütləqin muqayyədə həmli qaydasından hərəkət etmişlərdir.

İmam əbu Hənifə isə, zihar kəffarətində azad ediləcək kölənin mömin olması şərtini gətirməzkən, xəta ilə öldürmələrdə azad ediləcək qulun mömin olmasını gərəkdiyini söyləmişdir.

O, bunu edərkən, mütləqin muqayyədə həml edilməyəcəyi şəklindəki qaydasına dayanaraq, mütləq və muqayyəd ifadəli ayətlərin hər biri ilə öz kontekstləri içində əməl etmişdir.

Bu məsələ üsul kitablarında təfsilatlı olaraq izah edilmişdir.[1]

Bu əsllə bağlı olaraq fiqhin füru sahəsində başqa misallar da mövcuddur.

1 *bax: «Təshilu'l-Vusul», 62*

## 3.7. Ravinin, rəvayət etdiyi hədisə zidd əməlinin hökmü mövzusundakı ixtilaf:

Alimlərin ixtilaf etdiyi əsllərdən biri də, daha əvvəl nəql etdiyi rəvayətə zidd əməl edən ravinin, bu əməlinin hökmüdür.

Çoxluğu təşkil edən alimlər, belə bir ravinin əməlinin deyil, rəvayətinin əsas alınacağını söyləmiş; Hənəfilərsə, rəvayətinin deyil, əməlinin əsas alınacağına hökm etmişlərdir.

Hənəfilər belə bir halda, ravinin əməlini nasih mövqeyinə qoymuş, rəvayət etdiyi və xilafına əməl etdiyi hədisin qəbuluna maneə təşkil edən bir xüsus olaraq görmüşdür.

Hənəfilər, bu xüsusun açıqlamasında belə deyirlər:

«Əgər ravinin hədisə müxalifəti haqdırsa, o hədislə ihticac, batil olar;

Əgər ravinin hədisə müxalifəti batildirsə, o zaman da, ravinin ədalət sifəti düşər. Çünki (məşru bir dayanağı olmadan) hədisə müxalifət edən kimsə adil ola bilməz.»[1]

Cumhur isə, ravinin əməlini deyil, rəvayətini əsas alarkən, bu həqiqətə dayanmışlardır:

«Hüccət olma özəlliyi, ravinin əməlində deyil, rəvayətindədir. Çünki onun bu əməlinin ictihad nəticəsi olması da mümkündür; onun ictihadı isə, başqasını bağlamaz.»[2]

Bu üsul qaydasındakı ixtilafdan bəzi fəri ixtilaflar meydana gəlmişdir. Məşhur bir neçə misal zikr edəcək olarsaq:

### 3.7.1. Alimlərin, namazda rükuya gedərkən və rükudan qalxarkən, əllərin qaldırılıb-qaldırılmayacağındakı ixtilafları:

1 *«Fəvatihu'r-Rahamut», ll, 163*
2 *«Təshilu'l-Vüsul», 160*

Əksəriyyət, bu halda əllərin qaldırılacağını söyləmişdir. Çünki ibn Ömər (radiyallahu anh) belə rəvayət etmişdir:

«Allah rəsulu (sallallahu aleyhi və səlləm) namaza qalxdığı zaman əllərini, çiyinlərinə qədər qaldırar, sonra təkbir alardı. Rüku etmək istədiyi zaman da, belə edər, başını rükudan qaldırdığı zaman da, belə edərdi. Başını səcdələrdən qaldırdığı zaman isə, belə etməzdi.»[1] Altılar rəvayət etmişdir.[2]

Hənəfilər, bir yandan bir birinə zidd dəlillər mövcud olması, bir yandan da ibn Ömər (radiyallahu anh)'ın bu rəvayətə müxalif əməl etmiş olması səbəbilə, bu məsələdə çoxluğa müxalifət etmişdir.

---

1 Mövzu haqqında kifayət qədər məlumatı olmayan bəzi kimsələrin, xüsusilə Hənəfiləri bu məsələdə Sünnətə müxalifətlə ittiham etdikləri məlumdur.

Bu səbəblə, Hənəfi alimlər, bu tərz ittihamlara mövzu təşkil edən «namazda rükuya gedərkən və rükudan qalxarkən əllərin qaldırılması, imamın arxasında qiraət edilməsi...» kimi mövzulara xüsusi bir həssaslıqla yanaşmış, bu kimi məsələlər haqqında müstəqil əsərlər qələmə almaq məcburiyyətində qalmışdır.

«İmamu'l-Asr» Muhamməd Ənvərşah əl-Kəşmiri, «Nəylu'l-Fərqadeyn fi Məsələti Rəfi'l-Yedeyn» adlı əsərində, bu məsələni ola bildiyincə təfsilatlı bir şəkildə incələmiş və gəldiyi nəticəni əsərinin təqdimat qismində belə vermişdir:

«Bu mövzudakı 2 fərqli görüş, haqqın 2 fərqli yönünü təşkil etməkdədir. Bu görüşlər arasındakı fərqlilik, bir birini çürüdən 2 görüşün ixtilafı deyil, hər 2 görüşlə də ibadət edilə biləcəyini ortaya qoyan bir zənginlikdir. Hər 2 görüş də Allah rəsulu (sallallahu aleyhi və səlləm)'in sabit sünnətini göstərməktədir və səhabə vaxtından başlayaraq, Tabiun və Ətbau't-Tabiun... vaxtlarında əməl, hər 2 tərz üzərinə tətbiq edilərək gəlmişdir.

İxtilaf, hansı görüşlə əməlin daha əfdal olduğu nöqtəsindədir...»

Mövzu haqqında təfsilatlı öyrənmək istəyənlərin, bu əsəri, (Məcmu'atu Rəsaili'l-Kəşmiri, 1. Cild içində) mütaliə etmələri tövsiyə olunur. Bununla bərabər bax: Zəfər Əhməd ət-Təhanəvi, «İlau's-Sünən», lll, 56 və davamı, İdaratu'l-Quran və'l-Ulumu'l-İslamiyyə, Kəraçi, 1414/1993

2 *«Cəm'ul-Favaid», l, 190*

Mücahid'dən belə dediyi rəvayət edilmişdir[1] :

«İbn Ömər'in arxasında namaz qıldım. İlk təkbir xaricində əllərini qaldırmazdı.»[2]

### 3.7.2. Alimlərin itin yaladığı qabın necə yuyulacağı mövzusundakı ixtilafı:

Çoxluq, itin yaladığı qabın 7 dəfə yuyulacağını söyləmişlərdir. Dəlilləri də, əbu Hureyrə (radiyallahu anh)'ın rəvayət etdiyi bu hədisdir:

«Birinizin qabından it içdiyi zaman, onu 7 dəfə yusun.»

Əbu Davud, bu hədisi:

«...birincisi torpaq olmaq üzərə 7 dəfə...»

şəklində rəvayət etmişdir.

Bu hədis, Sahiheyn'də və daha başqa hədis kitablarında

---

1 Mücahid'in rəvayəti üçün bax: imam Tahavi, «Şərh-u Maani'l-Asar», I, 225

Abdullah ibni Ömər (radiyallahu anh)'ın, sadəcə namaza başlayarkən (iftitah təkbirində) əllərini qaldırdığı, bunun xaricində qaldırmadığı, Mücahidlə bərabər Abdulaziz b. Hukeym tərəfindən də rəvayət edilmişdir. Bax: «əl-Muvatta», (imam Muhamməd rəvayəti) 58

İmam Tirmizi, («Salat», 80), Abdullah b. Məsud (radiyallahu anh)'ın, dostlarına:

«Sizə Peyğəmbərin qıl(dır)dığı namaz kimi namaz qıldırım mı?» dedikdən sonra, sadəcə ilk təkbirdə əllərini qaldırdığını, bunun xaricində bir daha əllərini qaldırmadığını rəvayət edir və belə deyir:

«Bu babda, əl-Bəra b. Azib (radiyallahu anh)'dan da rəvayət vardır. (...) Abdullah ibni Məsudun hədisi həsəndir. Peyğəmbər (sallallahu aleyhi və səlləm)'in səhabələrindən və Tabiundan bir çox elm əhli də, bu görüşü (namazda sadəcə ilk təkbirdə əllərin qaldırılacağı görüşünü) mənimsəmişdir.»

2 *«Təshilu'l-Vüsul», 160*

müxtəlif ləfzlərlə rəvayət edilmişdir.[1]

Hənəfilər, ravisi müxalif əməl etdiyi üçün bu hədislə əməl etməmişdir. Tahavi və Daraqutni, əbu Hureyrə (radiyallahu anh)'ın, itin yaladığı qabı (hər səfərində) 3 dəfə yuduğunu rəvayət etmişlərdir.[2]

Üsul və fiqh kitablarında buna bənzər çox misallar mövcuddur.

Fəqihlərin, bəzi Üsul qaydalarındakı ixtilafdan dolayı, fəri məsələlərdə necə ixtilaf etdiyini göstərən misalları burada bitiririk.

İxtilaf səbəbləri bəhsini bağlayarkən, bir məqamı da təkrar vurğulamaq istəyirik:

Bu mövzuda tədqiqat aparan bütün alimlər, alimlərimizin ixtilaf səbəbləri arasında «müctəhidin həvası və şəxsi arzusu» diyə bir səbəb zikr edən kimsə yoxdur. Müsəlmanların imamlarını, belə hərəkət etmiş olmaqdan tənzih edərik.

Dinləri və imamlarının tərcüme-yi halı mövzusunda məlumat sahibi olmayan bəzi cahillər isə, imamların ictihadını, nəfsi həvaları doğrultusunda bəzi şəyləri halal və bəzi şeyləri haram qılan Yəhudi hahamlarının və Xristian rahiblərinin davranışına bənzədər!

*«---...Ağızlarından çıxan söz necə də ağırdır. Onlar yalandan başqa bir şey danışmırlar.»* **(Kəhf/5)**

O imamlar (Allah onlara rəhmət etsin), din və təqva sahəsində elmlərilə və əməllərilə nümunə kimsələr idilər. Hətta onlardan hər biri, dəlilin zənni olduğu qənaətini daşıdığı hallarda hökm verərkən -dini və elmi mövzuda ehtiyata riayət edərək- «haram» və «halal» təbirlərini istifadədən uzaq

1 *Buxari, Vudu/32, Muslim, Təharət/89*

2 *bax: Tahavi, «Şərh-u Maani'l-Asar», I, 21 və davamı; Daraqutni, «Sünən», I, 63 və davamı*

durardılar.

Bu mövzuda Zərkəşi'nin «əl-Bahru'l-Muhit»də, əs-Saydalani'dən verdiyi nəql, bizə kifayət edər:

«Mutəqaddimun alimlərin sözlərində keçən ümumilikdə budur. Onlar belə mövzularda qəti hökm verməkdən qaçarkən:

'---Dilinizin uydurduğu yalana əsasən: "Bu halaldır, o haramdır!"– deməyin...» (Nəhl/116)

ayətinin xitab etdiyi kimsə olmaqdan ikrah edərlər, bu səbəblə, «haram» ifadəsini istifadə etmək istəməzlərdi.» [1]

*1 Zərkəşi, «Bahru'l-Muhit», 109 və davamı (Daru'l-Kutubi'l-Mısriyyə'dəki yazma nüsxə*

## 1. Alimlərin fiqhi ixtilaflar qarşısındakı davranışları

Fiqhi ixtilafların həqiqəti, qaynağı və səbəbləri mövzusunda, bura qədər gördüklərimizdən ortaya çıxan həqiqət budur:

Alimlərin əhkam mövzusunda ixtilaf etməsi:

1. Həm nasların ehtimallı quruluşundan;

2. Həm də ağıl və anlayışların fərqliliyindən iləri gələn və qaçılması mümkün olmayan təbii bir haldır.

Bu qəti nəticə ilə bərabər, Sələfin və sonra gələn alimlərin, bəhs mövzusu ixtilaflar qarşısındakı davranışını incələyən kimsə, bu mövzuda fərqliliklər mövcud olduğu təəssüratı doğuran xüsuslarla qarşılaşa bilər. Bunlar, eyni zamanda bəzi tələbələrdə, zehni (fikri) qarışıqlığı və alimlərdən bu mövzuda nəql edilənlərlə, bizim yuxarıda çatdığımız qəti nəticənin necə birləşdirilə biləcəyi nöqtəsində, təəccüb doğuran xüsuslardır.

Bu səbəblə -faydaları tamamlamaq və möhtəməl (fikri) qarışıqlıqları ortadan qaldırmaq üçün- bu bölmədə, alimlərdən bu mövzuda nəql edilənlərə yer vermək istəyirəm. Burda zikr edəcəyim ifadələrin necə açıqlanması və başa düşülməsi gərəkdiyi xüsusunda da, şübhə və tərəddüdlərə yer qoymayacaq şəkildə izahlar verəcəyəm...

Hafiz Əbu Ömər ibn Abdilbərr, «Cami'u bəyani'l-ilmi və fadlih» adlı əsərində, «Fəqihlərin ixtilaflarını incələyən kimsə üçün bağlayıcı olan xüsusların bəyanını ehtiva edən bab» başlığı ilə xüsusi bir bölmə açır və belə deyir:

Mən ( İbni Abdi'l-Bərr) belə deyirəm:

Alimlər bu mövzuda 2 görüş halında ixtilaf etmişlərdir:

1. Səhabə və onlardan sonrakı imamların ixtilafı geniş bir rəhmətdir. Allah rəsulu( ﷺ ) 'in əshabının (səhabələrinin)

ixtilaflarını incələyən kimsənin, onlardan istədiyi kimsənin görüşünü alması caizdir.

Digər imamların görüşlərini incələyən kimsə üçün də, hal belədir.

Yetər ki, alınan görüşün xətalı olduğu bilinən olmasın.

Əgər bir kəs, bəhs mövzusu olan görüşün, Kitab və ya Sünnət'in nassına (Quran və Sünnət'də, bir iş və ya məsələ haqqında açıqlıq və heç bir təvilə ehtiyacı olmayan söz və ya dəlil; açıq və ya qəti hökmə) yaxud alimlərin icmasına ziddliyi səbəbilə xətalı olduğunu açıq bir şəkildə bilərsə, o zaman o görüşə tabe olması, caiz olmaz.

Yox əgər, bəhs mövzusu görüşün, zikr edilən qaynaqlara ziddliyini açıq bir şəkildə bilə bilməzsə, hansı görüşü almaq istərsə, onu alması caiz olar; istərsə, o görüşlər içində hansının doğru, hansının xətalı olduğunu bilməsin.

Bu halda, hər hansı bir şəxs, bir alimi təqlid etməsi caiz olan avam məsabəsindədir (mövqeyindədir). Belə kimsə, hər hansı bir alimə fətva soruşduğunda, aldığı cavabla əməl edər; istərsə, aldığı cavabın dəlilini bilməsin...

«Bu, məna olaraq, Ömər b. Əbdü'l-Əziz, əl-Qasım b. Muhammməd və -əgər səhihdirsə- Sufyan əs-Sevri'dən nəql edilmiş olan görüşdür.»[1]

Alimlərdən bir qrup da, bu görüşü mənimsəmişdir. Onların bu mövzudakı dəlillərindən biri də:

---

1 Bu məna, imam Süfyan əs-Sevri haqqındakı kitabımda bəzilərinə işarət etdiyim müxtəlif qaynaqlarda nəql edilmişdir. Necə ki, Xatib əl-Bağdadi, «əl-Fəqih və'l-Mütəfəqqih» əsəri, 2. Cild, s. 69'da, Sufyan əs-Sevri'nin bu sözünü nəql etmişdir:

«Fəqihlərin ixtilaf etdiyi mövzularda, qardaşlarımı, o görüşlərdən hər hansı birini almaqdan çəkindirmərəm.»

‘Səhabələrim, ulduzlar kimidir. Hansına tabe olsanız, hidayət taparsınız.’ hədisidir.[1]

---

1 Bu hədis, bir çox zəif yoldan rəvayət edilmişdir. Bəhs mövzusu rəvayət yollarından heç biri, səhih deyildir. Hədisin taxrici və haqqında deyilənlər üçün, bax: “Haşiyət-u Fəthi Babi’l-İnayə”, I, 13-14.

• İbnu’l-Mulaqqin, “əl-Bədru’l-Munir”də (IX, 585 və davamı); və

• İbn Həcər, “əl-Təlhisu’l-Xabir”də (IV, 350-351), bu hədisin rəvayət yollarını zikr etmiş və zəif tərəflərini bir-bir sıralamışdır.

• Əl-Beyhaqi, “əl-İtiqad və’l-Hidayə”də (s. 437 və davamı), bu rəvayətin mənasının, əbu Musa əl-Əşari (radiyallahu anh) tərəfindən rəvayət edilən:

“Ulduzlar, səmanın əmin-amanlığıdır, ulduzlar getdiyi (yəni qiyamət qopub söndükləri) zaman, göy əhlinə vəd edilən şey gələr.

Mən, əshabım üçün, əmin-amanlığam. Mən gedincə, əshabıma vəd olunan şey gələr.

Əshabım da, ümmətimin əmin-amanlığıdır. Onlar gedincə də, ümmətimə vəd olunan gələr.» (Muslim, «Fədailu›s-Sahabə», 207)

hədisi tərəfindən, qismən də olsa, təyid edildiyini (dəstəkləndiyini, qüvvətləndiyini) bildirmişdir.

İbn Həcər, onun bu təsbitini qismən dəstəkləyir və belə deyir:

“Əl-Beyhaqi, doğru söyləmişdir. Bu hədis, xüsusi olaraq, Səhabənin ulduzlara bənzədilməsinin doğru olduğunu göstərməkdədir. Ancaq əbu Musa (radiyallahu anh) hədisi, Səhabələrə tabe olmaq xüsusunda, açıq bir təyid ehtiva etməkdədir.”

İbn Həcərin, «əl-Əmali›l-Mutlaqa»dakı (s. 60-61) görüşü, daha açıqdır. Orda:

“Səhabələrimin ümmətim içindəki misalı, ulduzlar kimidir. Hansına tabe olsanız, hidayət taparsınız.”

hədisini zikr etdikdən sonra, belə deyir:

“Bu hədisi, Daraqutni, ‘Kitabu’l-Fədail’da, Abdullah b. Kamilin, Abdullah b. Ravh’dan rəvayəti olaraq nəql etmişdir...”

İbn Abdi›l-Bərr də bu rəvayəti, Daraqutni›nin sənədilə taxric etmiş və:

“Bu rəvayət, dəlil olaraq istifadə edilə bilməz. Çünki (sənədindəki) əl-Haris b. Ğusayn, məchul bir ravidir.”

“Bu, elm əhlindən bir qrupun zəif gördüyü bir görüşdür. Fəqihlərin və dirayət əhli (incəlikləri qavrayış gücünə sahib) alimlərin əksəriyyəti, bu görüşü rədd etmişlərdir.

Biz bu bölmədə -şərt qoşduğumuz kimi- in şə Allah, görüşləri

demişdir. (bax: ibn Abdi’l-Bərr, “Camiu’l-Bəyani’l-İlm və Fadlih”, ll, 925)

“Mən isə deyirəm ki:

İbn Hibban, bu şəxsi, «əs-Siqat»da, zikr etmiş («əs-Siqat», Vlll, 181) və Hüseyn b. Əli əl-Cu›fi, ondan rəvayətlər nəql etmişdir.

Bu halda, bu şəxsdən (biri Hüseyn b. Əli əl-Cu’fi, digəri də ibn Abdi’l-Bərr’in zikr etdiyi sənəddə yer alan Səllam b. Süleyman olmaq üzərə) 2 nəfər rəvayət etməkdədir. Dolayısı ilə, belə bir ravi haqqında, “məchuldur” deyilməz.

(Əl-Haris b. Ğusayn’dan rəvayət edənlər, sadəcə ibn Həcərin zikr etdiyi 2 nəfər deyildir. Daraqutni, “əl-Mu’təlif və’l-Muxtəlif”də (lV, 1778), bu şəxsdən, Səllam b. Süleyman, Yəhya b. Ya’la əl-Əsləmi və daha başqalarının rəvayət etdiyini söyləyir. Bu halda, bu şəxsdən, adları tasrih edilmiş (açıqlanmış) olaraq rəvayət edənlərin sayı, ən az 3 olmaqdadır...)

“Bəli, bu rəvayəti ondan nəql edən Səllam b. Hüseyn haqqında,

• əbu Xatim: “Qüvvətli deyildir.”;

• ibn Adiyy və Uqayli: “Munkəru’l-hədisdir.” demişlərdir. Ancaq:

• Nəsai “əl-Kuna”da (bax: Mizzi, “Təhzibu’l-Kəməl”, Xll, 287), bəzi şeyxlərindən, onun siqa olduğunu söylədiklərini nəql etmişdir.”

İbn Həcər bu əsərində belə deyərkən, «Muvafaqatu›l-Xubri›l-Xabər»də (l, 146), əl-Haris b. Ğusayn haqqındakı cəhalət iddiasına əhəmiyyət verməyib bu rəvayətin əsas zəifliyinin, Səllam b. Süleyman olduğunu söyləməsi, təəccüb vericidir. Halbuki, ibn Adiyy, onun bütün hədislərinin gözəl/həsən olduğunu, ancaq özünə mütabaat edən (tabe olan) kimsə mövcud olmadığını söyləmişdir. (bax: “əl-Kamil”, lV, 328).

Halbuki, əl-Haris b. Ğusayn’dan rəvayətdə, özünə ən azı 2 nəfərin mütabaat etdiyini, yuxarıda gördük.

Digər tərəfdən, ət-Tibi, “əl-Kaşif ən Haqaiqi’s-Sünən”də (ll, 674-675), əs-Sağani’nin, bu rəvayətin həsən olduğunu söylədiyini nəql edir.

Burda icmal olaraq zikr etdiyimiz xüsuslar, bir bütün olaraq göz önünə alındığında, bu rəvayətin, ən azından “həsən li-ğayrihi” mərtəbəsində olduğunu söyləmək, -Allahu alim- yalnış olmaz.)

qarşılaşdıraraq və icmal halda dəlillərilə bərabər zikr edəcəyik. Güc və qüvvət Allah'dandır."

Əhl-i hədisə mənsub mutəqaddimundan (əvvəlkilərdən) və sonra gələnlərdən bir qrup da, bu görüşə meyl etmişdir.

Daha sonra ibni Abdi'l-Bərr, haqqında danışdığı alimlərdən, mənimsədikləri görüşü ifadə edən nəqllər verir. Onlardan bəziləri belədir:

2. Əl-Qasım b. Muhamməd b. Əbi Bəkr, belə deyir:

"Allah Taala, Allah Rəsulu ( ﷺ )'in səhabələrinin əməldə ixtilaf etməsilə, bu ümməti mənfəətləndirmişdir. Onlardan hər hansı birinin əməlinə tabe olan və onun kimi əməl edən hər kəs, bu mövzuda bir genişlik içində olduğunu və özündən daha xeyirli olan səhabənin o tərzdə əməl etdiyini düşünər..." (Xatib əl-Bağdadi, "əl-Fəqih və'l-Mütəfəqqih" əsəri, 2. Cild, s. 59-60)

Ömər b. Əbdü'l-Əziz'dən də belə dediyi rəvayət edilmişdir:

"Allah Rəsulu ( ﷺ )'in səhabələri ixtilaf etməmiş olsa, bundan sevinc duymazdım. Çünki onlar tək bir görüş üzərə hərəkət etmiş olsaydılar, insanlar sıxıntı çəkərlərdi.

Onlar, özlərinə tabe olunan imamlardır. Bir kimsə onlardan birinin görüşünü aldığı zaman, genişlik içində olar."

əl-Qasım b. Muhamməddən «imamın açıqdan oxumadığı bir namazda, camaatın imamın arxasında qiraət etməsi məsələsi» haqqında soruşulduğunda belə cavab verir:

'Əgər qiraət edərsənsə, Allah rəsulu'nun səhabələrindən nümunələrin vardır.

Əgər qiraət etməzsənsə, yenə Allah rəsulu›nun səhabələrindən nümunələrin vardır.»

Yəhya b. Səid'in də belə dediyi rəvayət edilmişdir:

“Fətva əhli, fətva verməyə davam edir. Hər hansı bir şey üçün, biri: ‘halaldır’, digəri: ‘haramdır.’ deyir.

‘Haramdır.’ deyən, ‘halaldır.’ deyənin;

‘Halaldır.’ deyən də, ‘haramdır.’ deyənin, bu görüş səbəbilə həlak olduğu düşüncəsini daşımır...”

Daha sonra İbni Abdi’l-Bərr, belə deyir:

“Bu, Əbu’l-Qasım b. Muhamməd ilə ona tabe olanların görüşüdür. Bir qrup alim də bu görüşü mənimsəmişdir.”

“Malik, Şafii və onların yolundan gedən tələbələri ilə Leys b. Sa’d, Əvzai, Əbu’s-Sevr və dirayət əhli (incəlikləri qavrayış gücünə sahib) bir qrup alim isə:

“Araları birləşdirilməsi mümkün olmayan ixtilaflarda, tərəflərdən birinin görüşü doğru, digərinki xətalıdır.” deyirlər.

Onlara görə alimlər, ixtilaf etdikləri zaman, tərəflərin üsuluna uyğun olaraq, Kitab, Sünnət, İcma və Qiyas’dan nə kimi dəlillərə sahib olduqlarını soruşmaq lazımdır. Bu, nəzərdən qaçırılmamalıdır.

Əgər tərəflərin dəlilləri bərabər qüvvətdə olarsa, zikr etdiyimiz üzərə, Kitab və Sünnətdə yer alan hökmə ən çox bənzəyən görüşə meyl etmək lazımdır.

“Bu hal, aşkar şəkildə bəlli olmazsa, təvaqquf etmək (bəhs mövzusu etdiyimiz görüşlərdən hər hansı birini almamaq) gərəkdir.

Yəqinliklə (qəti bir şəkildə) məlumat sahibi olmadan qəti danışmaq isə, caiz deyildir.

Əgər hər hansı bir kimsə, öz şəxsilə məhdud olmaq üzərə, bu tərz görüşlərdən biri ilə əməl etməyə məcbur qalarsa, təqlid kontekstində avama caiz olan, ona da caiz olar...»

Daha sonra ibni Abdi'l-Bərr, adı keçən imamlardan bəzilərindən, zikr edilən görüşü dəstəkləyən nəqllər verir ki, onlardan bəziləri belədir:

"Əşhəb'dən: 'Malik'ə, Allah rəsulu (ﷺ) 'in səhabələrinin ixtilafları soruşuldu:

Tərəflərdən biri isabətli, digəri xətalıdır; bu tərz məsələlərdə, hansı görüşün tərcih ediləcəyinə, araşdırılaraq qərar verilməlidir.' dedi."

İbnu'l-Qasım belə deyir:

"Malik və Leys'in, Allah rəsulu (ﷺ)'in səhabələrinin ixtilafları haqqında:

'İnsanların söylədiyi kimi, onların ixtilaflarında bir genişlik yoxdur; hal elə deyildir. Onlar ixtilaf etdiklərində biri isabətli, digəri xətalıdır.' dediklərini eşitdim."

Yəhya belə deyir:

"Mənə, Leys b. Sa'd'ın belə dediyi gəlib çatmışdır:

'İxtilaflı görüşlər gəldiyində, ehtiyata ən uyğun olanını alarıq."

İbni Abdi'l-Bərr, bu haqda daha bir çox nəql verir. Yuxarıda zikr etdiyimiz ikinci görüşü mənimsəyənlərin dəlillərini zikr etdikdən və Sələf'in, ictihadi məsələlərdə birbirilərinin xətalı olduğunu söylədiklərini vurğuladıqdan sonra isə, belə deyir:

"Alimlərin kitablarında bu tərz çox nəql vardır. Allah rəsulu (ﷺ)'in səhabələrinin, Tabiunun və onlardan sonra gələn alimlərin ixtilaflı mövzulardakı mövqeləri budur. Onların birbirilərinin görüşlərini rədd etdikləri məsələlər -bir babda toplamaq belə dursun- hardasa, bir kitabda toplana bilməyəcək qədər çoxdur. Zikr etdiyimiz xüsuslarda, zikr etmədiklərimiz üçün yetərli dəlil vardır."

“Allah rəsulu ( ﷺ )’in səhabələrinin bir-birilərinə rücu etməsi (yəni ixtilaf edən səhabələrdən birinin, digər səhabənin görüşünə dönməsi) və bir-birilərinin görüşlərini rədd etmələri- ixtilaf etdikləri xüsuslarda, görüşlərdən birini xətalı, digərini isə, isabətli gördüklərinin dəlilidir.”

“Bu səbəblə, onlardan hər biri, qarşısında xitab etdiyi kimsəyə:

‘Sənin söylədiyin də caizdir, mənim söylədiyim də. İkimiz də, özü ilə hidayətə gedilən ulduzlarıq:

Dolayısı ilə, ixtilaf etməyimizdən dolayı, bizə hər hansı bir məsuliyyət yoxdur.’ deməzdilər.

İxtilaf edilən və arası birləşdirilə bilməyən mövzularda, tərəflərdən sadəcə birinin söylədiyi doğrudur.

Əgər ixtilaf edilən məsələdə, tərəflərin ikisi də doğruya isabət etmiş olsaydı, Sələf, ictihad və fətvalarında bir-birilərinin xətalı olduğunu söyləməzdilər.

Ağıl da, bir şeyin və ziddinin, eyni anda doğru olmasını, qəbul etməz.”

Sələf’in fiqhi ixtilaflar mövzusundakı mövqelərinə dair ibni Abdi’l-Bərr’in nəqllərini ərz etdikdən sonra dəyərləndirməmiz belədir:

1. İbni Abdi’l-Bərr’in nəql etdiyi ayrılıqlar, fiqhi ixtilafın şəxsən özü olmadığı kimi, şəxsən bu ixtilafa dair bir hökm də ehtiva etməməkdədir. Onun nəql etdiyi ayrılıqlar, insanların ixtilaf qarşısında fərqli mövqe tutmaları ilə bağlıdır.

Çünki o alimlərdən hər biri, bir digəri ilə çox məsələdə felən ixtilaf etmişlərdir. Onlardan hər hansı birindən:

- bu ixtilafların varlığını;
- alimlərdən qaynaqlandığını; və ya

• qaynağını doğru görmədiyinə;

dair, hər hansı bir şey nəql edilmiş deyildir.

Onlarda gördüyümüz mövqe fərqliliyi, insanların fiqhi ixtilaflar mövzusundakı qavrayışına yönəlikdir. Onlardan nəql edilən ifadələr, bu nöqtəni açıq bir şəkildə göstərməktədir.

2. Burda bəhs mövzumuz olan mövqe fərqliliyi, avamdan olan kimsələrin və ya avam hökmündə olanların deyil, ixtilaflı məsələlərdə dəlilləri incələyən alimin mövqeyinə dairdir.

İbni Abdi'l-Bərr'in zikr etdiyi mövzu başlığı da bunu açıqca göstərməktədir:

"Fəqihlərin ixtilaflarını incələyən kimsə üçün bağlayıcı olan xüsusların bəyanını ehtiva edən bab"

Açıqdır ki, alimlərin ixtilafını incələyən kimsə, bu xüsusda hər hansı bir "elmi təchizat"a sahib olmayan avam deyil, bu işə əhil olan alim kimsədir.

İbni Abdi'l-Bərr'in zikr etdiyi ilk görüşü mənimsəyənlərdən söz edərkən, istifadə etdiyi ifadə də, bunu göstərməktədir:

"...Bu mövqedə, hər hansı bir şəxs, bir alimi təqlid etməsi caiz olan avam məsabəsindədir. Belə kimsə, hər hansı bir alimə fətva soruşduğunda, aldığı cavabla əməl edər; istərsə, aldığı cavabın dəlilini/izahını bilməsin..."

Ayrıca, ibni Abdi'l-Bərr'in zikr etdiyi ikinci görüşü mənimsəyənlərdən söz edərkən, istifadə etdiyi bu ifadə də, eyni nöqtəyə dəlalət etməktədir:

"...əgər hər hansı bir kimsə, öz şəxsilə məhdud olmaq üzərə, bu tərz görüşlərdən biri ilə əməl etməyə məcbur qalarsa, təqlid kontekstində avama caiz olan, ona da caiz olar..."

Burdan ortaya çıxmaqdadır ki, zikr edilən görüşlərin hər hansı birini, mütləq doğru olaraq anlamaq və fərqli kontekstlərdə

istifadə etmək; misal olaraq:

• avamı bu məsələlərlə muxatab etmək; və

• onları qavrayamayacaqları bir yük altında qoymaq; yaxud da

• onlara anlaya bilməyəcəkləri şəkildə xitab etmək, doğru deyildir.

3. Eyni şəkildə, "Səhabənin və alimlərin ixtilafında rəhmət və genişlik vardır." deyənlərin -ki, ibni Abdi'l-Bərr'in zikr etdiyi ilk görüş budur- qəsd etdiyi "genişliyi" belə anlamaq lazımdır:

Səhabə və alimlər, şəri hökmlər sahəsində, ictihad etmiş; bunun nəticəsi olaraq, aralarında ixtilaf baş vermişdir. Onların ictihadları və ixtilafları, özlərindən sonra gələn alimlər üçün, onların əməl etdiyi kimi əməl etmək şəklində ortaya çıxan bir genişlikdir.

(Yəni, daha sonra gələnlərə, ictihad etmələri üçün bir genişlik vardır. İctihad, sadəcə əvvəlkilərlə məhdudlaşmamışdır.)

Çünki onlar da sələfləri- Allah rəsulu(sallallahu aleyhi və sələm)'in səhabələri və onlara gözəl bir şəkildə tabe olanlar- kimi ictihad etmiş və dəlillərdən hökm çıxarmaqda, ixtilaf etmişlərdir.

Bu mənadakı "genişlik", "ixilaflı məsələlərdə doğru, təkdir." deyənlərin bu görüşünə qəti olaraq zidd düşmür.

Çünki alimə düşən, ixtilaflı görüşlər mövzusunda ictihad edib, haqq və doğru olduğuna qənaət gətirdiyi görüşü tərcih etməkdir.

Bu nöqtədə onun doğruya isabət edib-etməməsinin bir əhəmiyyəti yoxdur.

Qadı İsmayıl'ın, mənasını açıq bir şəkildə dilə gətirdiyi izah da bu istiqamətdədir. İbni Abdi'l-Bərr belə nəql edir:

“Allah rəsulunun səhabələrinin ixtilafındakı genişlik, ancaq rəy ictihadındakı genişlikdir. Yoxsa birinin, haqlı və doğru görmədiyi halda, onlardan birisinin görüşünü qəbul etməsi mənasında bir genişlik, bəhs mövzumuz deyil. Lakin onların ixtilaf etmiş olması, ictihad edib bunun nəticəsi olaraq, ixtilaf etdiklərini göstərir.”[1]

İbni Abdi’l-Bərr, Qadı İsmayıl’ın bu ifadələrinin ardından belə deyir:

“İsmayıl’ın bu sözü, həqiqətən də gözəldir.”

4. Eyni şəkildə, ixtilafın rəhmət və genişlik olmadığını söyləyənlərin -ki, ibni Abdi’l-Bərr’in nəql etdiyi ikinci görüş budur- mövqeyini də belə anlamaq lazımdır:

Onlara görə, bəhs mövzusu olan genişliyi, müctəhid alimin, əvvəlkilərdən hər hansı birinin görüşünü, ictihad etmədən və dəlilə rücu etmədən (dönmədən) ala biləcəyi mənasına görə izah etmək doğru deyildir. Çünki belə bir halda, əksəriyyəti təşkil edən alimlərin qadağan etdiyi bir hal ortaya çıxacaqdır:

“Müctəhidin başqasını təqlid etməsi!”[2]

Alimlərin arasındakı ixtilaflarda və münazirələrdə, felən ortaya qoyduqları mövqe də, zahirən bir biri ilə zidd görsənən sözlərinin necə anlaşılması gərəkdiyi nöqtəsində verdiyimiz bu izahı dəstəkləməktədir.

Çünki onlardan hər biri, digərlərinin görüşlərinə -xətalı olsalar belə- hörmət göstərməklə birlikdə, ictihad edərək vardığı, özünə tətminlik verəcək görüşü əsas alar.

Bununla bərabər, onların hamısı, avamın, -müxtəlif görüşlər içərisindən haqq olan hansıdırsa, onu tərcih etmək kimi bir külfət (çətinlik) bəhs mövzusu olmadan- məsələlərini ona ərz etdiyi elm əhlini təqlid etməsinin, caiz olduğunu söyləmişlərdir.

1 *İbni Abdi’l-Bərr, Cami’u bəyani’l-ilmi və fadlih, 2. Cild, s. 82*

2 *Ğazzali, “Mustasfa”, ll, 384*

Süfyan əs-Sevri'nin, daha əvvəl də zikr etdiyimiz bu sözü, həqiqətən də gözəldir:

"Fəqihlərin ixtilaf etdiyi mövzularda, qardaşlarımı, o görüşlərdən hər hansı birini almaqdan çəkindirmərəm."[1][2]

---

1 *"Əl-Fəqih və'l-Mütəfəqqih", II, 69*

2 Nəvəvi, "əl-Minhac"da, mövzu haqqında bu görüşlərə yer vermişdir: Xattabi dedi ki: Nəbi (sallallahu aleyhi və səlləm)'dən:

"Ümmətimin ixtilafı, bir rəhmətdir." dediyi rəvayət edilmişdir...

...Xattabi, davamla deyir ki:

Bu hədisə, 2 nəfər etiraz etmişdir:

• Bunlardan biri, dininə bağlılığı xüsusunda tənqid edilmiş, ittiham altında olan biridir. O da, Amr b. Bahr əl-Cahız'dır.

• Digəri isə, bəsitlik və müstəhcənliklə (ədəbsizliklə) bilinən biridir. Bu da, İshaq b. İbrahim əl-Məvsili'dir. Çünki o, "əl-Əqani" adlı kitab yazıb bu kitabdakı batillərdə işi irəli götürdükdən sonra, bunların günahları ilə kifayətlənməyərək, kitabının başına hədis əhlini pisləməklə başlamış və onların dirayət edib anlamadıqları şeyləri rəvayət etdiklərini söyləmişdir. Özü və Cahız:

"Əgər ixtilaf rəhmət olmuş olsaydı, ittifaq, əzab olmalı idi..."

demişlər və sonra da ümmətin ixtilafının, xüsusi olaraq Nəbi (sallallahu aleyhi və səlləm)'in dövründə bir rəhmət olduğunu irəli sürmüşlərdir. Çünki aralarında ixtilaf etdikləri vaxt, Ondan sual soruşar, O da, özlərinə bəyan edərdi.

Belə qeyr-i məqbul bir etiraza cavab da, belədir:

Bir şeyin rəhmət olması, onun ziddinin əzab olmasını gərəkdirməz. Belə bir şeyə, cahil, ya da bilməzlikdən gələn başqası bağlı qalmaz və bunu bəhs mövzusu etməz. Necə ki, uca Allah da:

"O, Öz mərhəməti ilə sizin üçün gecəni və gündüzü yaratdı ki, dincələsiniz və Onun lütfündən ruzi axtarasınız. Bəlkə, şükür edəsiniz." (Qasas/73)

buyurmaqdadır.

Uca Allah, gecəni rəhmət deyə vəsf etməklə birlikdə, bundan gündüzün əzab olması gərəkməməkdədir. Bu isə, haqqında şübhənin bəhs mövzusu olmayacağı açıq-aydın bir xüsusdur...

...Xattabi davam edərək belə deyir:

## 2. İxtilaflı məsələlərdə müxalifi qınamaq və çəkindirmək:

Fiqhi ixtilafların hökmü və alimlərin bu məsələlər qarşısındakı davranışı ilə ən əhəmiyyətli xüsuslardan biri də, ixtilaflı məsələlərdə qarşı tərəfin qınanması və çəkindirilməsi məsələsidir.

Müxtəlif dövrlərdə yaşamış fərqli məzhəblərə məxsus alimlərin bu mövzudakı davranışını incələyənlər, əmr-i bi'l-maruf və nəhy-i 'əni'l-münkərin (yaxşılığı əmr edib pisliklərdən çəkindirməyin) şərtlərindən birinin, çəkindirilməsi bəhs mövzusu olan xüsusun münkər olduğu mövzusunda icmaya bənzər bir ittifaq mövcud olduğunu görəcəklərdir.

Bəzi alimlər bu mövzuda təfsilata gedilməsi gərəkdiyini söyləmişlərdir. Bu başlıq altında alimlərin mövzu ilə bağlı görüşlərini ehtiva edən bir qisim nəqllər verəcəyik:

1. Əbu Nuaym, sənədilə Süfyan əs-Sevri (rahmətullahi

---

Din xüsusunda ixtilaf, 3 qismə ayrılır:

• Bunlardan biri, Yaradıcının varlığı və birliyi haqqındadır. Bunu inkar etmək, küfrdür;

• İkincisi, Onun sifətləri və məşiəti ilə bağlıdır. Bunu inkar etmək, bidətdir;

• Üçüncüsü isə, haqqında fərqli hökmlərin mövcud olma ehtimalı olan fər›i əhkamdır (təfərrüata aid hökmlərdir).

Bax uca Allah, bunu bir rəhmət və elm adamları üçün bir üstünlük səbəbi qılmışdır.

"Ümmətimin ixtilafı rəhmətdir." sözündən qəsd edilən də budur...

Xattabi'nin (Allah ona rəhmət etsin) sözləri burda sonlanmaqdadır.

(Nəvəvi, "əl-Minhac fi Şərh-i Sahih-i Muslim b. Haccac", Vəsiyyət kitabı, 5/6- "Haqqında vəsiyyət edəcəyi bir şeyi olmayan kimsənin vəsiyyət etməməsi babı", 4203-4210 no-lu hədislərin şərhi)

aleyh)'in belə dediyini rəvayət etmişdir:

"Bir kimsənin, hökmü haqqında ixtilaf edilmiş bir fel işlədiyini görərsənsə, sən təsdiq etməsən də, onu qınayıb çəkindirməyə qalxma!"[1]

Xatib əl-Bağdadi də, onun bu sözünü nəql edir:

"Fəqihlərin ixtilaf etdiyi mövzularda qardaşlarımı, o görüşlərdən hər hansı birini almaqdan çəkindirmərəm." [2]

2. İbn Muflih, "əl-Adabu'ş-Şəriyyə" adlı əsərində, "Füru sahədə, ixtilafın caiz olduğu mövzularda, ictihad edənə qınama yoxdur." başlığı altında bir bəhs açır və belə deyir:

"əl-Mərruzi'nin rəvayət etdiyinə görə, imam Əhməd belə demişdir:

'Fəqihin, insanları bir tək məzhəblə əməl etməyə məcbur etməsi və bu mövzuda şiddət göstərməsi, uyğun deyildir."

İmam Əhməd'dən, şahmat oyunu haqqında və daha başqa xüsuslarda bu sözü ilə zidd düşən başqa rəvayətlər də nəql edilmişdir. Ondan nəql edilən bir başqa rəvayət də belədir:

'Müctəhidə qınamaq yoxdur; qınamaq müqəllidə yönəlikdir.'

Qadı əbu Ya'la'nın "əl-Ahkamu's-Sultaniyyə'də belə dediyi nəql edilmişdir:

"Hər hansı bir mövzuda ixtilaf zəif olar[3] və görüşlərdən biri ilə əməl edilməsi, üzərində ittifaq edilmiş bir məhzur'ə (özündən həzər ediləcək bir hala) qapı açarsa -"riba-i nəqd"

---

1 *Əbu Nuaym, "Hilyətu'l-Əvliya", VI, 368, Daru'l-Kitabi'l-Arabi", 1369/1949*

2 *"əl-Fəqih və'l-Mutəfəqqih", II, 69*

3 "İxtilafın zəif olması"ndan məqsəd, tərəflərin görüşlərinin bir birinə yaxın olması və buna bağlı məsələdə, dəlillərin fərqli anlaşılmağa çox da uyğun olmamasıdır. Dolayısı ilə, ixtilafın zəif olduğu məsələlərdə, ittifaqa yaxın bir hal var deməkdir.

[1] kimi- (...) bunu çəkindirmək, mühtəsibin (İslam Dövləti'ndə, dini hökmlərin tətbiq edilməsində vəzifəli kimsənin) səlahiyyət dairəsinə girər."[2]

İmam Əhməd'dən gələn rəvayətlərin, Qadı əbu Ya'la'nın ifadə etdiyi nöqtəyə həml edilməsi halında, rəvayətlərin arası cəm edilmiş, bir birinə zidd görüşlər, uyğun bir hala gətirilmiş olur.

Buna görə, ixtilaflı məsələlərdə müxalif görüşlə əməl edən kimsə, ancaq ixtilafın zəif olduğu hallarda qınanar və çəkindirilər. Riba-i nəqd'in hökmündəki ixtilafda olduğu kimi. Əhməd'dən nəql edilən, şahmat və başqa oyunları oynayanların bundan çəkindiriləcəyi şəklindəki görüş də, buna qiyas edilir.

İbn Teymiyyə'nin bu mövzuda söylədikləri də, bu izahı dəstəkləyən mahiyyətdədir.

İbn Muflih, "əl-Ədəbu'ş-Şəriyyə"də (I, 186) və Səffarini, "Ğizau'l-Əlbab"da (I, 219), ibn Teymiyyə'nin belə dediyini nəql edir:

"İxtilaflı məsələlərdə çəkindirmək yoxdur." sözü, doğru deyildir. Çünki çəkindirmə, ya bir mövzuda hökm verməyə və ya felə yönəlikdir.

Əgər hökmə yönəlikdirsə və bəhs mövzusu hökm, Sünnətə və ya əvvəlki bir icmaya ziddirsə, söz birliyi ilə, o hökmün çəkindirilməsi gərəkdir.

Əgər belə deyilsə, -hökmün zəifliyini göstərmək mənasında- muxatab (xitab edilən kəs) çəkindirilir.

Zikr etdiyim bu hökm, "ixtilaflı məsələlərdə doğruya isabət

1 Riba-i fazl mənasında istifadə edilən bir termindir. (bax: "əl-Məvsu'atu-Fiqhiyyə", XXII, 58)

2 *İbn Muflih, "əl-Adabu'ş-Şəriyyə", I, 186, Məktəbətu'r-Riyad əl-Hadisə, 1391/1971*

edən bir nəfərdir, digərləri xəta etmişdir.” deyənlərə görədir, ki, onlar Sələfin və fəqihlərin çoxunu təşkil edərlər.

Əgər çəkindirmək felə yönəlikdirsə və bəhs mövzusu fel, Sünnətə və ya icmaya ziddirsə, onun da çəkindirilməsi -çəkindirilmənin dərəcələrinə görə- gərəkdir...»

«...Əgər çəkindirilməyə mövzu olan feldə, sünnət və ya icma mövcud deyilsə, o məsələdə ictihada yer var deməkdir. Dolayısı ilə, o feli işləyən kimsə -istər müctəhid, istər müqəllid olsun- qınanmaz və çəkindirilməz.»

Daha sonra ibn Teymiyyə, bu məsələdə vaqe olan fikir qarışıqlığına və ixtilafa işarət edərək belə deyir:

“Bu məsələdəki fikir qarışıqlığı, bu nöqtədən qaynaqlanmaqdadır:

(İxtilaflı məsələlərdə çəkindirmək olmaz deyən) bir kimsə, ixtilaflı məsələlərin ictihadi məsələlər olduğuna inanır. Necə ki, insanlardan bir qisminin inancı da belədir. Halbuki -imamların da mənimsəmiş olduğu kimi- doğrusu da budur ki:

İctihadi məsələlər, özü ilə əməl etməyin açıq bir şəkildə vacib olduğu və özü qüvvətdə ziddi mövcud olmayan səhih hədis kimi bir dəlil mövcud olmadığı məsələlərdir.

Əgər belə bir dəlil yoxdursa, geriyə qalan dəlillərin qüvvətdə bir birinə yaxınlığı və ya dəlillərdəki qapalılıq səbəbilə ictihad caiz olur.

Məsələnin qəti olduğunun söylənməsində[1] , ona müxalifət

1 İbn Teymiyyə’nin burda qəsd etdiyi “qəti məsələlər”, haqqında açıq və səhih bağlayıcı hədis olan, dolayısı ilə, hökmü yəqinliklə bilinən məsələlərdir.

Yuxarıda nəql edilən sözlər, müctəhid imamlardan “hiyəl” kontekstində nəql edilən məsələlərin və özlərinə hədis çatmadığı üçün hədisə zidd hökm verdikləri halların bəhs mövzusu edildiyi bir kontekstdə keçməkdədir. (*əl-Fətava’l-Kubra”, Vl, 96-97, Muhammməd Abdulqadir Ata  Mustafa Abdulqadir Ata təhqiqi ilə, Daru’l-Kutubi’l-İlmiyyə, Beyrut, 1408/1987)*

edən müctəhidlərə qüsur isnad etmək kimi bir hal yoxdur. Bu da eynilə Sələfin ixtilaf etdiyi sair məsələlər kimidir. Biz, o məsələlərdə ixtilaf halındakı 2 görüşdən birinin səhih olduğunu yəqinliklə bilirik. Əri ölmüş qadının, uşağını doğmaqla iddət müddətini doldurmuş olacağı məsələsi belədir.

Bununla bərabər, boşalmaq vaqe olmadan edilən cinsi münasibətdən dolayı qüslun gərəkcəyi hökmü də belədir. Riba-i fəzlin və mutə nigahının haramlığı da yenə eyni şəkildədir...”

İbn Teymiyyə, burda daha sonra bu tərz bir çox məsələ zikr edir...

əs-Səffarini (rahiməhullah), ibn Teymiyyə’nin yuxarıda keçən sözlərini nəql etdikdən sonra, belə deyir:

“Allah ondan razı olsun, bu surətlə bizə öyrətmiş olmaqdadır ki, çəkindirmək, ancaq Kitabdan açıq və Sünnətdən səhih və sarih (açıq) bir nassa və ya daha əvvəlki bir icmaya müxalifətin bəhs mövzusu olmadığı ixtilaflı məsələlərdə olmaz. Bunlardan birinə müxalifət bəhs mövzusu olarsa, çəkindirmək caizdir.”

“Onun sözündən anlaşıldığına görə, nə zaman 2 sünnət bir birinə zidd düşərsə, ya özlərilə əməlin caiz olacağı və dəlil olaraq istifadə edilməyə əlverişli şəkildə sihhətində bir birilərinə yaxın olarlar və ya belə olmazlar.

Əgər belə olarlarsa, mövzu, çəkindirmənin caiz olmadığı ictihad sahəsinə girər. Əks halda, çəkindirmək caiz olur. Bu halda, şahmat oynayan və ya tədil-i ərkanı (namaz qılarkən hər bir hərəkəti, əzalar yerli yerinə gələcək şəkildə tam etməyi) tərk edən kimsə (görüldüyündə) bundan çəkindirilər.

Çünki tədil-i ərkana riayət mövzusunda səhih sünnət (rəvayətlər) mövcuddur; şahmat oynamağın qadağanlığı mövzusunda da çox rəvayətlər gəlmişdir. Ən doğrusunu Allah

Taala bilir..."[1]

4. Allamə ibn Rəcəb əl-Hənbəli, "Camiu'l-Ulum və'l-Hikəm" əsərində belə deyir:

"Çəkindirilməsi gərəkli olan münkər, üzərində icma mövcud olan münkərdir.

Üzərində ixtilaf edilmiş xüsuslara gəlincə, dostlarımızdan bir qismi, bu tərz felləri -istər müctəhid olsun, istərsə, təqlidin caiz olduğu mövzularda bir müctəhidi təqlidən olsun- işləyənlərin çəkindirilməsinin vacib olmadığını söyləmişlərdir.

Qadı əbu Ya'la, "əl-Ahkamu's-Sultaniyyə"də ixtilafın zəif olduğu xüsusları, bu hökmdən istisna etmişdir...[2]

İmam Əhməd'dən açıq və qəti bir şəkildə nəql edilən odur ki, şahmat oynayan bundan çəkindirilər.

Qadı (əbu Ya'la) bu ifadəni, şahmat oynamağın caizliyinə ictihad yolu ilə hökm etmədən və ya belə hökm etmiş bir müctəhidi təqlid etmədən şahmat oynayan kimsələrin qəsd edildiyi şəklində təvil etmişdir ki, bu təvil mübahisəlidir.

Çünki imam Əhməd'in, hökmü haqqında ixtilaf edilmiş olan nəbizi içənə hədd vurulacağını söylədiyi, açıqca nəql edilmişdir. Hədd isə, çəkindirmə metodlarının son nöqtəsidir.

Bununla birlikdə, nəbiz içən kimsə, imam Əhmədə görə, fasiq sayılmaz. Bu da göstərməktədir ki, imam Əhməd -ixtilafın zəif olduğu- ixtilaflı hər məsələdə çəkindirmə olacağı görüşündədir. Çünki sünnət nəbizin haram olduğuna dəlalət etməkdədir. Bununla birlikdə, bir təvilə dayanaraq nəbiz içən kimsə ədalət vəsfini itirmiş olmaz. Vallahu aləm..."

"Eyni şəkildə imam Əhməd, namazını kamil bir şəkildə qılmayan, rüku və səcdələri tam etməyən kimsənin də

---

1 *əs-Səffarini, "Ğizau'l-Əlbab", I, 219-220, Məktəbətu'r-Riyad əl-Hadisə*

2 *"əl-Ahkamu's-Sultaniyyə", 297*

çəkindiriləcəyini söyləmişdir. Halbuki, bunların vacib olub-olmadığı mövzusunda ixtilaf vardır..."[1]

5. İbn Qudamə (rahmətullahi aleyh) belə deyir:

"Heç kimsənin, bir başqasını, öz məzhəbi ilə əməl etməyə məcbur etməsi doğru deyildir. Çünki ictihadi mövzularda qınamaq və çəkindirmək olmaz."[2]

6. Hüccətü'l-İslam imam Ğazzali, "İhya-u Ulumi'd-din" əsərində, hisbə[3] üzərində durarkən belə deyir:

"Hisbənin ediləcəyi xüsuslar: Xüsusilə araşdırmadan muhtəsibin açıqca gördüyü, münkər olduğu ictihad bəhs mövzusu olmadan məlum olan hər münkərdir."

Daha sonra münkərin dördüncü şərti üzərində durarkən bunları deyir:

"Münkər olduğunun, ictihada mövzu olmadan bilinməsidir. Dolayısı ilə, ictihada yer təşkil edən hiç bir mövzuda, hisbə edilməz. Bu etibarla:

• Hənəfinin, kərtənkələ əti yediyi; və ya

• Heyvan kəsərkən Bismillahı qəsdən tərk etdiyi üçün bir şafini;

• Bir şafinin də, sərxoş etməyəcək dərəcədə nəbiz içdiyi və qohum-əqrəba mirasını yediyi və ya şuf'a[4] haqqına istinadən

1 *İbn Rəcəb əl-Hənbəli, "Camiu'l-Ulum və'l-Hikəm", s. 284, əl-Babi əl-Hələbi nəşriyyat, 1369/1949*

2 *İbn Muflih, "əl-Ədəbu'ş-Şəriyyə", 1. cild, s. 186 və davamı*

3 Hisbə: İslam Dövləti'ndə, ümumi əxlaqı, cəmiyyətin təhlükəsizliyini və asayişi təmin və əmr-i bi'l-maruf və nəhy'i əni'l-münkər kimi vəzifələri ifadə edən bir məfhum. Bu işi görən kimsəyə də, muhtəsib deyilir.

4 Şuf'a haqqı: Satış və ya bu hökmdəki bir əqdlə alınmış daşınmaz və ya daşınmaz hökmündəki şəxsi mülkiyyətə mövzu olan bir malı, müştəriyə satıla biləcək bir qarşılıqla öz mülkiyyətinə keçirməkdir.

aldığı evdə oturduğu...üçün, çəkindirməsi doğru deyildir. Bütün bunlar, ictihadın cari olduğu mövzulardır.” [1]

7. İmam Nəvəvi, Muslim’in rəvayət etdiyi:

“Sizdən kim bir münkər görərsə...” hədisini şərh edərkən belə deyir:

“Bu da var ki, ancaq əmr edəcəyi və nəhy edəcəyi şeyi yaxşı bilən kimsə, əmr edər və nəhy edər. Bu, əmr ediləcək və ya nəhy ediləcək şeyə görə dəyişir.

Əgər namaz, oruc, zəkat, zina, içki və s. kimi açıq fərzlər və məşhur haramlar bəhs mövzusudursa, bunları hər müsəlman bilir.

Əgər xüsusi bir diqqət istəyən söz və fellərlə ictihada dair xüsuslar bəhs mövzusudursa, bu, avamın girə biləcəyi bir sahə deyildir. Çünki bu tərz xüsuslara müdaxilə, alimlərin işidir.

Digər yandan, alimlər də, imamların üzərində icma etdiyi xüsuslarda çəkindirmə işini görə bilərlər.

Haqqında ixtilaf edilmiş məsələlərə gəlincə isə, onlardan çəkindirilməz. Çünki 2 görüşdən birinə görə, hər müctəhid doğruya isabət etmişdir.

Mühəqqiq alimlərin bir çoxunun, hətta əksəriyyətinin tərcihə uyğun gördüyü görüş budur.

Digər görüşə görə isə, ixtilaflı məsələlərdə, sadəcə tərəflərdən biri doğruya isabət etmişdir. Ancaq kimin doğruya isabət və kimin xəta etdiyi bizcə bilinməməkdədir və xəta edəndən də günah qaldırılmışdır.

Lakin əgər ixtilaflı məsələlərdə biri, muxatabını ixtilafdan qurtulmağa təşviq edərsə, nə olar?

---

*1 Ğazzali, “İhya-u Ulumi’d-Din”, II, 320 və davamı, əl-Matbaatu’l-Əmiriyyə, 1322/1904*

Əgər yumşaqlıqla edərsə, bu, gözəl, sevilən və təşviq edilən bir fel olar.

Çünki alimlər, bir sünnəti zədələməyə və ya bir başqa ayrılığa yol açmayacaqsa, ixtilafdan qurtulmağa təşviq etmək üzərində icma etmişlərdir.

Qadıların qadısı əbu'l-Həsən əl-Mavərdi əl-Basri əş-Şafi, "əl-Ahkamu's-Sultaniyyə"də[1], sultanın hisbə təşkilatının başına keçirtdiyi kimsənin, əgər özü müctəhiddirsə:

1. Fəqihlərin ixtilaf etdiyi xüsuslarda, xalqı öz məzhəbi ilə əmələ sövq edib edə bilməyəcəyi;

2. Başqa birinin məzhəbi üzərə əməl edilən xüsusların icrasında bir dəyişikliyə gedib getməyəcəyi mövzusunda

alimlər arasında görüş ayrılığı mövcud olduğunu zikr etmişdir.

Ən səhih olan görüş -yuxarıda zikr etdiyimiz xüsuslar gərəyincə-onun bu mövzuda bir dəyişikliyə gedə bilməyəcəyidir. Fəri məsələlərdə ixtilaf, Səhabə, Tabiun və onlardan sonra gələnlər (Allah hamısından razı olsun) vaxtlarında davam edib gəlmişdir.

Dolayısı ilə, nə muhtəsib, nə də bir başqası, müxalif görüşlə əməl edən bir başqasını bundan çəkindirə bilməz.

Eyni şəkildə, alimlər belə demişdir:

"Müftünün və qadının, özünə müxalifət edən kimsəyə -əgər o kimsə bir nassa, icmaya, yaxud açıq bir qiyasa zidd hərəkət etmirsə- etiraz etmə haqqı yoxdur. Vallahu aləm..."[2]

8. Allamə Şeyx Molla Əli əl-Qari, Nəvəvi'nin yuxarıda keçən

---

1 Qadı əbu Ya'lanın eyni adlı əsəri ilə qarışdırılmamalıdır.

2 *Nəvəvi, "Şərh-u Muslim", ll, 23, Dar'u İhyai't-Turasi'l-Arabi, Beyrut, tarix yoxdur*

sözlərinin bir hissəsini nəql etmiş, özü də o görüşə etimad etmişdir.[1]

9. Allamə ibn Həcər əl-Məkki də, Nəvəvi'nin sözlərinin bir qismini nəql etmiş və dəstəkləmişdir.

Eyni şəkildə, imam Qurtubi əl-Maliki'dən də belə bir nəql vardır:

"Hər hansı bir imam, şəri bir açıqlaması olan bir görüş mənimsədiyində, ona zidd bir görüş mənimsəyən kimsənin, o görüşlə əməldən çəkindirməsi caiz deyildir. Bu, üzərində görüş ayrılığı olmayan bir məsələdir."[2]

Bütün bu xüsusların bizə göstərdiyi həqiqət budur:

Alimlər, bu məsələnin əslində ittifaq halındadırlar. O əsl budur:

Əgər müxalifəti ictihadi bir məsələyə dairdirsə -hər nə qədər bəzi alimlər ixtilafın zəif olması ilə qüvvətli olması arasında fərq mövcud olduğunu söyləmişlərsə də- müxalif kimsə qınanmaz və çəkindirilməz.

Bizim meyl etdiyimiz, müxtəlif görüşlərin arasını birləşdirmək nöqtəsində əvla və ixtilaflı məsələlərdə nəticə olaraq ən əlverişli gördüyümüz görüş isə, budur:

Məsələ, bir yöndən ixtilaf edilən mövzunun, digər yöndən də çəkindirilməsi bəhs mövzusu olan münkərin növünə dair olaraq təfsil edilməlidir.

Mən isə, deyirəm ki:

2.1. Üzərində ixtilaf edilmiş olan ictihadi məsələlərdə əsl olan, qarşı tərəfin qınanıb çəkindirilməməsidir. Aşağıdakı xüsuslar bunun istisnasını təşkil edirlər:

1 *Əli əl-Qari, "Mirqatu'l-Məfatih Şərh-u Mişqati'l-Məsabih", Əsbah li Mətabi, Bombey, V, 3-4*

2 *İbn Həcər əl-Məkki, "əl-Fəthu'l-Mubin fi şərhi'l-Ərbəin", 264*

a) Haqqındakı ixtilafın, tarixdə qaldığı, bu gün üçün yaşadılmasının doğru olmadığı məsələlər. Riba-i fəzlin və ya mutə nigahının hökmündə, Sələf arasında cərəyan etmiş ixtilaf buna nümunədir.

Bütün bu mövzularda alimlər, müxalif görüşdə olanların da, ən nəhayətində çoxluğun görüşünə döndüklərini nəql etmişlərdir.

Yaxud bu mövzulardakı müxalif görüşləri, alimlər, "şazz görüş" olaraq dəyərləndirmişlərdir.

Dolayısı ilə, bu kimi mövzularda qınama və çəkindirmə, bilinən şərt və mərtəbələrinə riayət edilərək icra edilir.

b) Əgər bir məsələdəki ixtilaf, alimlər nəzərində zəif bir ixtilafdırsa, burada 2 hal bəhs mövzusu olur:

Birinci hal: Əgər çox zəif bir ixtilaf bəhs mövzusudursa, müxalifin mənimsəyib icra etdiyi hökm, sabit bir nassla zidd düşürsə və müxalif zəif bir şübhədən hərəkətlə o görüşü mənimsəyibsə, -musiqi alətlərinin istifadəsi belədir- bu halda, müxalif kimsə, o görüşlə əməl etməkdən çəkindirilir.

İkinci hal: Bəhs mövzusu olan məsələ ictihadi olub, haqqında heç bir surətdə bir nass mövcud deyilsə, bu mövzudakı görüşlərdən hər hansı birilə əməl edən kimsə, qınanmaz və çəkindirilməz. Ancaq ixtilafı ortadan qaldırmaq məqsədilə, nəsihət qəbilindən və əmr-i bi'l-maruf və nəhy-i əni'l-münkər cümləsindən olaraq, o kimsə yumşaqlıqla çəkindirilər.

Çünki bu kimi məsələlər, hər nə qədər bir çox alim qatında çox əhəmiyyətli deyilsə də, başqa alimlər qatında əhəmiyyət daşıyır. Belə olması üçün, onun, mötəbər imamlardan birinin ictihadı ilə yetişilmiş bir məsələ olması yetərlidir.

Məsələyə belə yaxınlaşılmazsa, çəkişmə və ayrılıq meydana gələr; cədəl halları doğar. Çünki burda görüşlərin və anlayışların

bir birindən ayrıldığı bir məsələ bəhs mövzusudur.

2.2. Birinci maddədə zikr etdiklərimiz, mövzu haqqında ixtilaf mövcud olduğunu bilən alimin mövqeyi ilə bağlı idi.

Zəif görüşü qüvvətlidən ayıra bilməyən avama gəlincə, onun ixtilaflı görüşlərdən biri ilə əməl edən bir kimsəni çəkindirməyə qalxması, doğru olmaz. Ancaq məsələnin hökmünü yaxşı bilən güvənilən bir alimdən öyrənmiş olması və ya o kimi məsələləri, alimlərin qınayıb çəkindirdiyinin yayğın olaraq bilinməsi halı, bunun istisnasını təşkil edir.

Belə hallarda, avamın çəkindirməsi, alimləri təqlidən edilmiş bir çəkindirmə olur. O təqlid ki, avamın ona rücu etməkdən başqa yönələcəyi bir ünvan yoxdur.

Avamdan olan bir kimsənin, bir başqasını, özünün etdiyinə və ya alimlərdən birinin fətvasına zidd bir feli işləyərkən görməsi, onu çəkindirmək üçün yetərli deyildir. Avama mənsub çox kimsələrin, ixtilafa mövzu olmayan qəti məsələlərdən zənn etdiyi neçə-neçə ictihadi ixtilaflı məsələlər vardır!

Bu surətlə, böyük və təhlükəli bir qapı bağlanmış, Müsəlmanları zaman-zaman bir birilərinə qarşı düşmən mövqeyi almağına və vuruşmağa qədər sürükləyən parçalanmanın doğuracağı peşmançılıqlar, Müsəlmanlardan uzaqlaşdırılmış olacaqdır.

Bu mövzunu, allamə əd-Dihləvi’nin, alimlərin fiqhi ixtilaflarda, bir birilərini qınamamağa dair mövqeyini və feli davranışı açıqlayan sözlərilə bağlayacam.

Dihləvi belə deyir:

“Səhabə, Tabiun və onlardan sonra gələn alimlər arasında (namazda fatihədən sonra) bismillahı oxuyan da vardı, oxumayan da. Oxuyanlardan bir qismi onu açıqdan, bir qismi isə, gizli oxuyardı.

Yenə onlardan bəziləri sabah namazında qunut tutar, kimiləri tutmazdı.

Bununla bərabər, onlar arasında qan aldırmaqdan, qusmaqdan və burun qanamasından dolayı (bunların dəstəmazı pozduğunu düşünərək) dəstəmaz alanlar olduğu kimi, almayanlar da vardı. Bu mövzuda daha çox misallar verilə bilər...

Belə olduğu halda, onlar bir birilərinin arxasında namaz qılardılar.

Eynilə əbu Hənifə, tələbələri, Şafi və daha başqalarının (Allah hamısından razı olsun), Maliki Mədinə imamlarının və digərlərinin arxasında namaz qıldığı kimi. O imamlar, namazda (fatihədən sonra) gizli ya da açıqdan bismillahi oxumasalar belə, bu dəyişməzdi.

• Harun ər-Rəşid, qan aldırdıqdan sonra, yeni bir dəstəmaz almadan namaz qıldırmış, imam əbu Yusuf da onun arxasında (ona tabe olaraq) namaz qılmış,

("qan aldırdıqdan sonra dəstəmaz almaq gərəkdir, dolayısı ilə, Harun ər-Rəşid bu namazı dəstəmazsız qıldırmışdır." diyə düşünüb)

namazı yenidən qılmamışdır. Harun ər-Rəşidə imam Malik, qan aldırdıqdan sonra dəstəmaz almaq gərəkmədiyi şəklində fətva vermişdi.

• İmam Əhməd b. Hənbəl, burun qanamasının dəstəmazı pozacağı qənaətində idi. Özünə:

"İmam, vücudunun bir yerindən qan çıxtığında, yenidən dəstəmaz almadan namaz qıldıracaq olarsa, arxasında namaza durarsan mı?"

diyə soruşuldu. O isə, belə cavab verdi:

“İmam Malik’in, Səid b. əl-Musəyyəb’in arxasında necə namaz qılmayım?!”

• İmam əbu Yusuf və Muhamməd əş-Şeybani’nin, Bayram namazlarında (namaz qılarkən) ibn Abbas (radiyallahu anh)’ın mənimsədiyi sayda təkbir aldığı rəvayət edilmişdir. Çünki Harun ər-Rəşid, babası ibn Abbas (radiyallahu anh)’ın mənimsədiyi doğrultuda təkbir almaqdan xoşlanardı.[1]

• Şafi, əbu Hənifə’nin qəbrinin yanında Sabah namazı qılmış və təəddübən (ədəb gərəyi olaraq) qunut tutmamışdır.

Yenə O (imam Şafi), belə demişdir:

“İraqlıların məzhəbinə meyl etdiyimiz olmuşdur.”

• Malik, əl-Mənsur və Harun ər-Rəşidə daha əvvəl nəql etdiyimiz sözü söyləmişdir.

(Dihləvi’nin bu ifadədən qəsdi, əsərində daha əvvəl yer verdiyi bu hadisədir [2]:

“Əl-Mansur həcc etdiyində imam Malikə:

‘Sənin yazdığın bu kitabı çoxaldıb, müsəlmanların yaşadıqları mərkəzi şəhərlərin hər birinə göndərib, xalqa onun içindəkilərlə əməl etmələrini və onun xaricinə çıxmamalarını əmr etməyə qərar verdim.” dedi.

İmam Malik isə, belə cavab verdi:

---

1 İbn Abbas (radiyallahu anh)’ın bayram namazlarında aldığı təkbirlərin ədədi mövzusundakı rəvayətlər müxtəlifdir. Bəzilərində birinci rükətdə 7, ikinci rükətdə 6 təkbir aldığı nəql edilərkən; bəzilərində rüku təkbirləri xaric olmaqla birinci rükətdə 4 və ikinci rükətdə 3 təkbir aldığı rəvayət edilmişdir.
Məşhur olan ilk rəvayətdir. (bax: Tahavi, “Şərh-u Maani’l-Əsrar”, IV, 347; ibn Abdi’l-Bərr, “əl-İstizkar”, VII, 52)

2 *“əl-İnsaf fi bəyani əsbabi’l-İxtilaf”, 38*

“Ey Möminlərin əmiri, bunu etmə! Çünki xalqa daha əvvəl (Sələfdən) başqa görüşlər çatmışdır, onlar fərqli hədislər eşitmiş, rəvayətlər almışlardır. Hər bölgə xalqı, özlərinə çatan rəvayət və hökmləri əsas almış və ixtilaflı hallarda onlarla əməl etmişlərdir. Sən də hər şəhər insanını, özləri üçün tərcih etdikləri hökm və rəvayətlərlə baş başa burax.”

“Bu hadisə, Harun ər-Rəşidə nisbət edilir. Buna görə, o, imam Malik ilə, əl-Muvatta’nın Kəbəyə asılması və insanların onunla əməl etməklə mükəlləf tutulmaları mövzusunu istişarə edərkən, imam Malik belə qarşılıq vermişdir:

“Etmə! Allah rəsulu (sallallahu aleyhi və səlləm)’in səhabələri, fəri məsələlərdə ixtilaf etdilər və fərqli şəhərlərə yayıldılar. Onların fərqli tətbiqatlarının bütünü, sabit bir sünnəti göstərməkdədir.”

Bunun üzərinə Harun ər-Rəşid belə dedi:

“Allah səni müvəffəq qılsın, ey əbu Abdillah!”

Bu hadisəni, imam Suyuti nəql etmişdir.[1]

Daha sonra Dihləvi belə deyir:

“əl-Bəzzaziyə’də, ikinci imamdan -yəni əbu Yusuf’dan- nəql edildiyinə görə, o, bir cümə günü, hamamda qüsul alaraq, xalqa (o dəstəmazla) namaz qıldırmışdı.

Namaz bitib camaat da dağıldıqdan sonra, hamamın su quyusunda bir ölü siçanın olduğu xəbər verildi.

İmam əbu Yusuf, bunun üzərinə belə dedi:

“O halda, biz də, Mədinəli qardaşlarımızın görüşü ilə əməl edərik. Çünki onların məzhəbinə görə, su, qulleteyn miqdarına çatarsa, pislik daşımaz.”[2]

1 *Dihləvi, “əl-İnsaf”, 24-25*

2 Qullə: Bu günkü ölçülərlə, eni, uzunluğu və dərinliyi hər biri 54 sm olan

İmam əl-Xocəndi'yə:

Şafi məzhəbinə mənsub ikən, bir və ya iki il namazı tərk etmiş, daha sonra Hənəfi məzhəbinə keçmiş bir kimsənin, namazlarını bu məzhəblərdən hansına görə qəza etməsi soruşulduğunda, O, belə cavab verir:

"Cəvazına inandıqdan sonra, hansı məzhəbə görə qəza edərsə etsin, caizdir."

"Camiu'l-Fətava"da belə deyilir:

Hənəfi məzhəbinə mənsub bir kimsə:

"Filan qadınla evlənərsəm, 3 talaqla boşdur."

desə, sonra da fətva istədiyi Şafi məzhəbinə mənsub bir müftü özünə, evləndiyi o qadının boş olmayacağı, andının isə, batil olduğu şəklində fətva versə, bu məsələdə o kimsənin Şafi məzhəbinə tabe olmasında bir beis yoxdur. Çünki Səhabədən bir çox kimsə də, bu qənaətdədir."

İmam Muhammməd, "Əmali"sində belə deyir:

"Bir fəqih, xanımına:

'Əlbəttə sən boşsan.' desə, özü bu sözün 3 talaq mənasına gəldiyi görüşündə olduğu halda, daha sonra qadıya müraciət etsə və qadı bu sözün ric'i talaq[1] sayılacağına hökm etsə,

bir qabın ala biləcəyi su miqdarıdır ki, təxmini ölçülərlə 96 kq miqdarında su deməkdir.
Qulleteyn (2 qullə) isə, bunun 2 qatıdır.

Bu halda, -Şafilərə və Hənbəlilərə görə- eni, uzunluğu və hündürlüyü, minimum 108 sm olan bir hovuzda mövcud olan su, şəri olaraq "çox su" hökmündədir.

İçinə hər hansı bir pis şey düşməsi səbəbilə, rəng, dad, qoxu kimi özəllikləri dəyişmədikcə, şəran pis olmuş sayılmaz

1 Ric'i talaq: Ər-arvadı, bir birilərinə tamamilə haram qılmayan, geri dönüşü olan talaqdır. Bilindiyi kimi, belə talaqların sayı, ikidir. Üçüncüdə, qadın, bir başqası ilə, normal bir evlilik qurub sonra da normal bir şəkildə boşan-

bunda onun üçün bir genişlik vardır.

Haram saymaq, halal saymaq, qul azad etmək, mala əl qoymaq ya da başqa bir mövzu olsun, fərq etməz, fəqihlərin ixtilaf etdiyi hər məsələ belədir. Qadı'nın verdiyi hökmə muxatab olmuş bir fəqihin, o hökmü alıb tətbiq etməsi, öz görüşünü tərk edərək qadı'nın verdiyi hökmlə əməllə özünü bağlaması, uyğun olan bir davranışdır. '

İmam Muhammməd belə deyir:

"Eyni şəkildə elm əhli olmayan bir kimsə, başına bir çətinlik gəldiyində, fəqihlərdən soruşar, onlar da "halaldır" və ya "haramdır" deyə fətva verər, ancaq Müsəlmanların qadı'sından da o hökmə zidd bir hökm gerçəkləşərsə, -və o məsələ də fəqihlər arasında ixtilaflı bir məsələ olarsa- o kimsənin, fəqihlərin fətvalarını tərk edib qadı'nın verdiyi hökmü alması uyğun olar." [1]

Dihləvi, bəhs etdiyimiz əsərin bir başqa yerində də bunları deyir:

"İmam Əhməd belə deyərdi:

'Bir kimsənin şəri fətvalar sahəsində, alimlərin görüşlərini, məzhəblərini bilmədən fətva verməsi uyğun deyildir. Belə kimsəyə, məzhəblərini əsas aldığı alimlərin ittifaq etdiyini bildiyi bir məsələ haqqında sual soruşulacaq olarsa, "caizdir" və ya "caiz deyildir" deməsində bir beis yoxdur.

Bu halda, onun bu sözü, alimlərin üzərində ittifaq etdiyi hökmün nəqli yerinə keçər.

Əgər bəhs mövzusu məsələ haqqında alimlər ixtilaf etmişlərsə,

'Bu filan alimə görə caizdir, filan alimə görə caiz deyildir.

madıqca, ilk əri ilə evlənməsi, haramdır. (bax: Bəqərə/229-230)

1 *Dihləvi, "əl-İnsaf", 71*

deməsində bir əngəl yoxdur. Belə bir halda o kimsənin, dəlilini bilmədikcə ixtilaflı görüşlərdən birini tərcih edib, sual soruşana onunla cavab vermə səlahiyyəti yoxdur.”[1]

## 3. Alimlərin bir birinə qarşı ədəbinə misallar:

Alimlərin şəri hökmlərdəki ixtilaflı məsələlər qarşısındakı davranışını gördükdən sonra, sıra, onların bir birilərinə qarşı nümayiş ettirdikləri davranışa nümunələr verməyə gəldi.

Bu nümunələr, onların bir birilərinin görüşünə qarşı elmi ədəbə və hörmətə nə dərəcə riayətkar olduğunu, açıq bir şəkildə göstərməktədir. Bir birilərinə göstərdikləri ehtiram, onları, qarşılıqlı görüşlərini münazirə etməkdən uzaq tutmuşdur.

Burada bildirmək lazımdır ki, zikr edəcəyimiz nümunələr, əksər alimlərin davranışını göstərməktədir. Yuxarıda zikr edilən örnək, başqalarının görüşlərinə qarşı səbrsiz davranan, özlərinə müxalifət edənlərin açıqca batil olduğunu düşünən alimlər, hər zaman mövcud olmuşlardır.

Nə var ki, onların bu halı, necə şazz bir davranış içində olduqlarının göstəricisidir və bu davranış, bu ümmətin əvvəl gələnlərinin də, sonra gələnlərinin də, hər zaman qınadığı, üz çevirdiyi bir davranış olmuşdur.

Bu ümmətin əksəriyyətinin, ibn Hazm’ın üslub mövzusundakı davranışı -elminin genişliyi və məsələyə vaqifliyinin dərinliyini etiraf etməklə bərabər- hər kəsin məlumudur.

İxtilaf səbəblərinin birincisini ələ alarkən, ibn əbi Zi’b’in, alış-verişdə məclis muxayyərliyinin (seçim sərbəstliyinin) sübutu mövzusunda, özü kimi düşünməyən və:

“Alış-veriş edən 2 nəfərdən hər biri, ayrılmadıqca muxayyərdirlər.”

---

1 *Dihləvi, “əl-İnsaf”, s. 63*

hədisində keçən, “ayrılma”ğı, “söz olaraq ayrılmaq/alış-verişdən caymaq” olaraq təvil edən imam Malik mövzusundakı davranışını görmüşdük.

İbn əbi Zi’b, hədisi belə təvil etdiyi üçün:

“Malik, tövbə etməyə dəvət edilər. Tövbə edərsə, nə yaxşı; etməzsə, boynu vurular.”

demişdir. İmam Əhməd də onu tənqid edərək:

“Malik hədisi rədd etməmiş, bu şəkildə təvil etmişdir.” demişdir.

Burda hicrət yurdu (Mədinə) imamı Malik b. Ənəs ilə Misir fəqihi Leys b. Sa’d’ın, bəzi elmi məsələlər haqqında bir birilərinə göndərdikləri 2 məktubu zikr edəcəyik. Bu məktublar, adı keçən imamların hər birinin -elmdə yüksək mərtəbəni paylaşmaqları ilə bərabər- ədəb və əxlaqda necə uca bir mövqedə olduqlarına şahidlik etməkdədir.

Ümid edilir ki, bu məktublarda, ümumi olaraq oxuyucular, elmi tədqiqatlarında və münazirələrdə, özlərinə tabe olunacaq canlı bir nümunə taparlar. Çünki ədəblə zinətlənməyən elmdə heç bir xeyir yoxdur!

## 3.1. İmam Malik’in Leys’ə göndərdiyi məktub[1]

Mədinə əhlinin elmdəki üstünlüyü, başqalarının elminə tərcih edilməsi və Sələf’in onlara tabe olması haqqında:

“Malik b. Ənəs’dən, əl-Leys b. Sa’d’a...Salam sənin üzərinə

---

1 Bəyanuni’nin burda zikr etdiyi məktubun mətnində əksikliklər mövcud-dur. Biz hər 2 məktubun tərcüməsində də Abdu’l-Fəttah əbu Ğuddə’nin: “Nəmazəc min Rəsaili’l-Əimməti’s-Sələf”ində yer alan mətni (s. 29) əsas aldıq.

olsun. Özündən başqa ilah olmayan Allaha həmd olsun. Allah bizi də, səni də gizli və açıq (hər hal) da, əmirlərinə tabe olmaqla qorusun; bizi də, səni də, hər cür çirkinlikdən uzaq tutsun və səhhət içində qorusun.

Sənə bu məktubu yazdığım sırada, mən də, ailəm də, arzu etdiyin kimiyik. Həmd edilməyə layiq olan, Allahdır. Məktubun bizə gəldi. Halını və Allahın sənə olan -və məni sevindirən- nemətini zikr edirsən. Allahdan bizə və sənə ehsan etdiyi nemətlərin ən yaxşısını tamamlamasını və bizləri Özünə şükr edənlərdən qılmasını niyaz edirəm.

Mənə göndərdiyin[1] və görüşümü yazıb sənə göndərməyimi istədiyin kitablardan xəbərdar oldum.[2] İstədiyini etdim, o kitablarda yer alan bəzi xüsuslarda, arzu etdiyin kimi səhih olsunlar diyə dəyişiklik etdim və hər bir bağlamanı bükərək:

“Allah mənə yetər; O nə gözəl vəkildir.” yazan möhrümlə möhürlədim.

Səni yalnışa düşməkdən qorumaqdan və ehtiyacını ortadan qaldırmaqdan dolayı, xoşbəxtəm. Sən buna layiqsən. Sənin istədiyin şeyi yerinə gətirmək üçün, xüsusi bir vaxt ayırdım və digər məşğuliyyətlərimi tərk etdim. Onları mənə gətirənə verib sənə göndərdim. O kimsənin, sənin haqqına və hörmətinə riayət mövzusunda məni ilzam etdiyini (susdurduğunu) gördüm.

Bəhsə mövzu olan kitablar haqqında məndən məlumat istəməyin, sözün başında sənə nəsihət etməyim mövzusunda, mənə təşviq oldu. Bundan əvvəl bu tərz şey etməmiş

1 Bu ifadədən Malik’in, imam Leys’dən daha əvvəl bir məktuba cavab yazdığı aydın olmaqdadır. Ancaq o məktubun mətnini tapmaq mümkün olmadı.

2 Aydın olduğuna görə, imam Leys, imam Malik’ə göndərdiyi məktubda, Mədinəlilərə aid bəzi kitabların özünə çatdığını bildirmiş, muhtəvaları haqqında qəti qənaət gətirə bilmədiyi üçün, imam Malikə göndərib təhqiq etməsini istəmişdir.

olmağım, sənin haqqındakı qənaətimin əvvəldən bəri müsbət olmamasından dolayı deyildir. Bu qədər var ki, sən, daha əvvəl, mənimlə belə bir görüş alış-verişində olmamış, mənə bu tərz məktub yazmamışdın.

Bil ki, -Allah sənə mərhəmət etsin- sənin, insanlara, ətrafımızda və olduğumuz torpaqlardakı alimlərin görüşünə zidd fətvalar verdiyini eşitdim.

Sən ki, öz həmşəhərliləri nəzərində yüksək mövqeyi olan, özünə ehtiyac duyulan və görüşlərinə etimad edilən lider, fəzilət sahibi bir kimsəsən. Özün üçün qorxmalı və tabe olduğun təqdirdə, qurtulacağını umduğun şeyə tabe olmalısan.

Allah Taala əziz kitabında belə buyurur:

“Dində hamını ötüb keçən ilk mühacirlərə və ənsarlara, həmçinin yaxşı işlər görməkdə onların ardınca gedənlərə gəlincə, Allah onlardan razıdır, onlar da Ondan razıdırlar. Allah onlar üçün ağacları altından çaylar axan, içində əbədi qalacaqları Cənnət bağları hazırlamışdır. Bu, böyük uğurdur.» (Tövbə/100)

Yenə O, belə buyurmuşdur:

«---Tağuta ibadət etməkdən çəkinib Allaha üz tutanlara müjdə vardır. Qullarımı müjdələ! O kəslər ki, sözə qulaq asıb onun ən yaxşısına tabe olurlar, onlar Allahın doğru yola yönəltdiyi şəxslərdir. Ağıl sahibləri də məhz onlardır.» (Zumər/17-18)

İnsanlar ancaq Mədinə əhlinə tabedirlər. Hicrət ora edilmiş, Quran orda nazil olmuş, halal (orda) halal qılınmış, haram da (yenə orda) haram qılınmışdır.

Allah rəsulu (sallallahu aleyhi və səlləm) onların arasında yaşadığı üçün, onlar vəhyin və ayətlərin endiyi yerdə idilər. Allah rəsulu (sallallahu aleyhi və səlləm) onlara (vəhylə

istənilənləri) əmr edir, onlar da Ona itaət edir, O, onlara yol açır/sünnətlər təşri qılınır, onlar da Ona tabe olurdular.

Allah, Peyğəmbər (sallallahu aleyhi və səlləm) üçün Öz qatındakını tərcih edib Onu bu dünyadan alana qədər, bu hal beləcə davam etdi. Allahın salatı, salamı, rəhməti və bərəkəti Onun üzərinə olsun.

Sonra Onun ardından, ümmətini təşkil edən insanlar arasında, Ona ən çox tabe olanlardan iş başına keçənlərin dövrü gəldi. Onlar, hökmünü bildikləri hər hansı bir məsələ ilə qarşılaşdıqlarında, bildiklərini icra etdilər. Haqqında hər hansı bir şey bilmədikləri xüsuslarda isə, (bilənlərdən) soruşdular; sonra da (aldıqları cavablar içərisində), öz ictihadlarına və Peyğəmbər (sallallahu aleyhi və səlləm) dövrünə olan yaxınlıqlarının (özlərinə bağladığı işığa) görə, ən qüvvətli gördükləri görüşü əsas aldılar. Bu mövzuda biri, özlərinə müxalifət etdiyi və ya başqa bir görüşün daha qüvvətli və əsas alınmağa daha əlverişli olduğunu söylədiyi zaman, o görüş tərk edildi və digər görüşlə əməl edildi.

Onlardan sonra Tabiun da, bu yolu tutdu və bu sünnətlərə/hərəkət tərzlərinə tabe oldular.

Belə olduğu halda, bir xüsus, Mədinədə ortaya çıxar və özü ilə əməl edilərsə, heç kimsənin buna müxalifət etməsini doğru görmərəm. Bu, onların əlində olan və heç kimsənin sahiblənməyəcəyi və özünə aid edə bilməyəcəyi varislik səbəbi ilədir.

Mədinə xaricindəki İslam mərkəzlərində olanlar (hər hansı bir məsələ üçün):

«Torpaqlarımızda əməl bu şəkildədir.»

və:

«Bu, keçmiş alimlərimizin üzərində addımladığı bir

görüşdür.»

deməyə qalxacaq olsalar, güvənilən bir isnadla hərəkət etmiş olmazlar; Mədinə əhlinin bu mövzuda sahib olduğu haqq, onlar üçün bəhs mövzusu olmaz.

Bu səbəblə -Allah sənə mərhəmət etsin-, sənə yazdıqlarıma özün üçün yaxşı diqqət et.

Bil ki, məni bunları yazmağa sövq edənin, sadəcə Allah Taala üçün sənə nəsihət etmə, sənin yaxşılığını düşünmə məqsədi olduğunu umuram. Artıq sən də, bu məktubumu, haqqı olduğu şəkildə dəyərləndir. Əgər belə edərsən, bil ki, sənə nəsihət etməkdən geri durmaram.

Allah, bizi də, səni də, hər işdə və hər əhvalda, Özünə və Rəsuluna itaətə müvəffəq qılsın. Allahın salamı, rəhməti və bərəkəti, sənin üzərinə olsun.

Səfər ayının 9-cu günündə yazıldı.

## 3.2. İmam Leys b. Sa'd'ın imam Malik b. Ənəs'ə yazdığı məktub:

Salam sənin üzərinə olsun. Özündən başqa ilah olmayan Allaha həmd olsun. Allah bizə də, sənə də sihhət versin, gərək bu dünyadakı, gərəksə axirətdəki aqibətimizi gözəlləşdirsin.

Məktubun mənə çatdı. Halınızın yaxşı olduğunu yazmışdınız. Buna sevindim. Allah bu halınızı daim eləsin, Özünə şükr etməyimiz mövzusunda, bizə kömək edərək, bu nemətini tamamlasın və bizə olan ehsanını artırsın.

Sənə göndərdiyim kitabları, zaman ayırıb tədqiq etdiyini və möhrünlə möhürlədiyini yazmısan. Kitablar əlimizə çatdı. Allah bundan dolayı, səni xeyirlə mükafatlandırsın. Bunlar bizə, səndən nəqllərlə meydana gətirilmiş kitablar olaraq gəlmişdi;

mən də onların həqiqi halını, sənin tədqiqatından keçirərək anlamağı arzu etdim.

Sənin görüşünün nəzərimdəki dəyərini bildirən ifadələrimin, məktubuna mənə nəsihətlə başlamaq mövzusunda səni təşviq etdiyini yazmış və bu nəsihətlərin, tərəfimdən diqqətə alınacağını umduğunu bildirmisən.

Yenə bunu daha əvvəl etməkdən səni uzaq tutan şeyin, haqqındakı qənaətimin müsbət və gözəl olmaması deyil, indiyə qədər, belə bir mövzuda, səninlə müzakirə etməməyim olduğunu yazırsan.

Yenə bəzi mövzularda, sizin torpaqlardakı alimlər camaatının görüşlərinə zidd fətvalar verdiyimi eşitdiyini və fətva verdiyim insanların mənə güvənmələri dolayısı ilə, özüm üçün qorxmağım gərəkdiyini bildirirsən. Bununla bərabər, insanların, özünə hicrət edilmiş və Quran nazil olduğu yer olan Mədinədə olanlara (oranın alimlərinə) tabe olduğunu zikr etmisən.

Bu mövzuda yazdıqlarında, inşəAllah, doğruya isabət etmisən. Yazdıqların, mənim nəzərimdə, səni razı salacaq mövqeyi əldə etmiş olmaqdadır.

Elm adamı olduğu söylənilən insanlar arasında, mənim qədər şazz fətvalardan xoşlanmayan, daha əvvəl yaşamış Mədinə əhlinin alimlərini öndə tutan və onların üzərində ittifaq etdiyi fətvaları əsas alan kimsə bilmirəm. Həmd, Aləmlərin Rəbbi olan və heç bir şəriki olmayan Allaha məxsusdur.

Peyğəmbər (sallallahu aleyhi və səlləm)'in Mədinədə yerləşməsi və vəhyin orda Özünə, səhabələrin arasında ikən endiyi, Allahın vəhy vasitəsilə onlara öyrətdiyi, insanların da bu səbəblə, onlara tabe olduqları yolunda söylədiklərin, eyni dediyin kimidir.

Zikr etdiyin:

«Dində hamını ötüb keçən ilk mühacirlərə və ənsarlara, həmçinin yaxşı işlər görməkdə onların ardınca gedənlərə gəlincə, Allah onlardan razıdır, onlar da Ondan razıdırlar. Allah onlar üçün ağacları altından çaylar axan, içində əbədi qalacaqları Cənnət bağları hazırlamışdır. Bu, böyük uğurdur.» (Tövbə/100)

ayətinə gəlincə, bu ayətdə «dində hamını ötüb keçən kimsələr» olaraq zikr edilənlərin çoxu, Allahın razılığını umaraq, Allah yolunda cihad üçün (Mədinədən) çıxmış və ordugah şəhərlər qurmuşlardı. (Getdikləri yerlərdə) insanlar, onların ətrafında toplandı; onlar da insanlara Allahın kitabını və Peyğəmbər (sallallahu aleyhi  və sələmin) sünnətini açıqladılar, bildikləri heç bir şeyi onlardan gizlətmədilər.

Onlardan hər birinin olduğu yerdə, Allahın kitabını və Peyğəmbər (sallallahu aleyhi  sələm)'in sünnətini -Allah üçün- öyrədən, Quran və sünnətin açıqlamadığı xüsuslarda öz görüşü ilə ictihad edən qruplar var idi. Müsəlmanların özləri üçün idarəçi olaraq tərcih etdikləri əbu Bəkr, Ömər və Osman da, onların xətalarını düzəldirdi.

Bu 3 xəlifə, Müsəlmanların orduları ilə münasibətlərini kəsməmişlərdi, onların hallarından xəbərsiz deyillərdi. Əksinə o xəlifələr, ən kiçik bir mövzuda belə, Allahın kitabı və Peyğəmbər (sallallahu aleyhi və sələm)'in sünnətilə dini ayaqda tutmaq və ixtilafdan uzaq olmaq üçün, (onları yönləndirmək məqsədilə) məktublar yazırlardı. Bu 3 şəxs, Quranın açıqladığı, Peyğəmbər (sallallahu aleyhi və sələm)'in tətbiq etdiyi və ya Ondan sonra özlərinin üzərində istişarə (ilə icra) etdikləri bütün xüsusları, onlara bildirirlərdi.

Özlərinə belə bir əmr gəldiyi zaman, Misir, Şam və İraq'da olan səhabələr, əbu Bəkr, Ömər və Osman vaxtlarında onunla əməl etdilər. O 3 xəlifə, bu dünyadan köçənə qədər hal bu şəkildə davam etdi və (Mədinə xaricinə çıxmış olan

səhabələrə) bundan başqasını əmr etmədilər. Bu səbəblə İslam mərkəzlərində yaşayan müsəlmanların, sələfləri olan səhabə və tabiun'un əməl etmədiyi yeni bir şeyi, bu gün ihdas etmələrini (ortaya çıxarmalarını) caiz görmürəm. Sonra (sələf) alimlər(i) köçüb getdilər və onlardan geriyə, daha əvvəl keçənlərə bənzəməyən kimsələr qaldı.

Bununla birlikdə, Peyğəmbər (sallallahu aleyhi və səlləm)'in vəfatından sonra, səhabə, bir çox məsələnin hökmündə ixtilaf etmişdir. Əgər sənin zatən bildiyini bilməsəydim, bunları sənə yazardım. Səhabədən sonra da Tabiun'dan Sə'id b. əl-Müsəyyəb və bənzəri kimsələr, bir çox məsələdə daha çox ixtilaf etdilər.

Onlardan sonra gələnlər də, eyni şəkildə ixtilaf etmişlərdir ki, mən gərək Mədinə'də, gərəksə, başqa mərkəzlərdə onların məclislərində oldum. O vaxtlarda fətva mövzusunda ibn Şihab (əz-Zühri) və Rəbia b. əbi Abdirrahman, bunların başında gəlirlərdi. Rəbia'nın, öncə gələnlərə müxalif bəzi görüşlərini, sən də yaxından müşahidə etmişdin. Sənin, onun haqqındakı görüşünü eşitdim ki, bu, Mədinə əhlindən Yəhya b. Səid, Ubeydullah b. Ömər, Kəsir b. Fərqad və Kəsir'dən daha yaşlı olan -görüş sahibi- başqalarının da görüşüdür. Hətta onun bu görüşündən xoşlanmadığın üçün, onun məclisini tərk etmək məcburiyyətində də qalmışdın.

Səninlə və Əbdü'l-Əziz b. Abdillah'la Rəbia'nı ayıbladığımız bəzi xüsusları müzakirə etmişdik. O zaman ikiniz, Rəbianı ayıbladığım xüsuslarda, mənə haqq vermişdiniz. Siz də onun, mənim qınadığım görüşlərini qınayırdınız.

Belə olmaqla birlikdə -Allaha həmd olsun- Rəbia, xeyirli, ağıllı, xatib, fəzilət sahibi və müstəqim, ümumilikdə müsəlman qardaşlarına, xüsusi olaraq da bizə qarşı səmimi hörmət göstərən bir kimsə idi. Allah ona rəhmət etsin və özünü, əməlindən daha gözəli ilə mükafatlandırsın.

Özü ilə qarşılaşdığımız zaman ibn Şihab, çoxca ziddiyyətləri olan birisi olaraq diqqət çəkərdi. Birimiz özü ilə yazışdığında -görüşünün və elminin üstünlüyünə rəğmən- bir tək məsələ haqqında bir birilə zidd düşən 3 görüş bildirdiyi olurdu. Bu halda o, o mövzuda əvvəl verdiyi hökmü düşünmürdü. İbn Şihab'ın görüşlərini tərk etməyim səbəbilə, məni qınamışdın. Onu tərk etməyimin səbəbi budur. Onu qınamağım səbəbilə məni ayıbladığın xüsusları bilirəm.

1. Bunlardan biri, ordugah şəhərlərdən birində, müsəlmanların, yağışlı gecələrdə 2 namazı cəm etmə məsələsidir.[1]

Şam'ın yağışı, Mədinə'nin yağışından, Allahdan başqasının bilə bilməyəcəyi qədər çoxdur. Buna rəğmən, burda yaşayan müsəlmanların imamlarından heç biri yağışlı gecələrdə namazları qəti olaraq cəm etməmişdir. Halbuki, əbu Ubeydə b. əl-Cərrah, Xalid b. Vəlid, Amr b. əl-As və Muaz b. Cəbəl

---

1 Səfərilik bəhs mövzusu olmadan, muqim ikən, namazı cəm etmənin hökmü mövzusunda fəqihlər ixtilaf etmişlərdir.

• Hənəfi məzhəbinə görə, heç bir şəkildə 2 namaz birləşdirilib bir vaxtda qılınmaz.

• Malikilərə görə, yağışlı günlərdə məğriblə işa namazları cəm edilə bilər; zöhr və əsr, cəm edilməz. Zöhr və əsr, ancaq palçıq və qaranlıq varsa -yağış olmasa belə- cəm edilər.

• Şafilər, yağışın davamlı surətdə yağdığı günlərdə, zöhr ilə əsrin və məğriblə işanın cəm edilə biləcəyi görüşündədirlər. Şafilərə görə, muqim kimsə, yağış xaricində hər hansı bir halda namazları cəm edərək qıla bilməz.

• Hənbəlilər də Malikilər kimi, yağışlı gecələrdə, məğriblə işanın cəm edilə biləcəyi görüşündədirlər. Zöhr ilə əsr isə, yağış səbəbi ilə olsa belə, cəm edilə bilməz. (bax: ibnu'l-Munzir, «əl-İşraf alə məzahibi'l-uləma», I, 416-417, (əbu Hammad Sağir Əhməd əl-Ənsari təhqiqi ilə), Məktəbətu Məkkə əs-Saqafiyyə, əl-İmaratu'l-Arabiyyətu'l-Muttəhidə, 1425/2004; ibnu'l-Cevzi, «ət-Tahqiq fi məsəili'l-xilaf», IV, 71 və davamı (Zəhəbi'nin 'Tənkihu't-Tahqiq'i ilə birlikdə, Abdu'l-Muti Emin Qalaci təhqiq və təxrici ilə), Daru'l-Vayi'l-Arabi, Məktəbətu ibn Abdi'l-Bərr, Hələb, 1519/1998)

-ki, Peyğəmbər (sallallahu aleyhi və səlləm)’in onun haqqında:

‘Halal və haramı ən yaxşı biləniniz, Muaz b. Cəbəl’dir.’

və

‘Qiyamət günü Muaz b. Cəbəl, alimlərin bir addım önündə gələcəkdir.’

buyurduğu bizə çatmışdır-

Şurahbil b. Həsənə, əbu’d-Dərda və Bilal b. Rabah da aralarında idi.

Əbu Zərr, Zübeyr b. əl-Avvam və S’ad b. əbi Vaqqas Misirdə idilər. Homs’da (Suriya) və bütün ordugah şəhərlərdə Bədr döyüşünə qatılmış 70 nəfər var idi. İraqda ibn Məs’ud, Huzeyfə b. əl-Yaman və İmran b. əl-Huseyn vardı. Əli b. Əbi Talib də, yanında Peyğəmbər (sallallahu aleyhi və səlləm)’in səhabələrindən insanlar olduğu halda, burda illərcə qalmışdı. Bunlardan heç biri, məğriblə işa namazlarını qəti olaraq cəm etməmişdilər.

2. Bir nəfərin şahidliyi və haqq sahibinin andı ilə hökm vermə məsələsi də belədir[1].

Sən də yaxşı bilirsən ki, Mədinə’də bu şəkildə hökm verilməkdədir. Halbuki nə Şam, Homs və Misir’də, nə də

---

1 • Hənəfilərə görə, 2 şahidin mövcud olması lazım olan məsələlərdə bir şahid və iddia sahibinin andı ilə hökm verilə bilməz.
• Malikilər, bir şahidin və haqq sahibinin andı ilə hökm verilə biləcəyi görüşündədir.

• Şafilərin görüşü də, Malikilərin görüşü istiqamətindədir.

• Hənbəlilər də eyni görüşü (yuxarıdakı) mənimsəmişdir. (bax: ibn Abdi’l-Bərr, «əl-İstizkar», XXll, 51 və davamı)

İraq'da, səhabələr bu şəkildə hökm vermişdir. Bu şəkildə hökm vermələrini onlara, hidayət rəhbərləri olan rəşidi xəlifələr: əbu Bəkr, Ömər, Osman və Əli də yazmamışdır.

Daha sonra Ömər b. Əbdu'l-Əziz iş başına gəldi, ki, o, sünnətləri ihya, bidətləri önləmək mövzusundakı icraatlarında və dini əhkamları iqamədəki ciddiyyətində, görüşündəki isabətdə və əvvəlkilərin tətbiqatlarına vaqiflikdə, sənin yaxşı bildiyin kimsədir.

Ruzeyq b. əl-Hukeym ona:

"Sən Mədinədə ikən, bir nəfərin şahidliyi və haqq sahibinin andı ilə hökm vermişdin."

diyə yazmışdı. O da cavab olaraq belə yazdı:

"Biz Mədinədə belə hökm vermişdik. Ancaq Şamlıların başqa bir tətbiqatı mənimsədiyini gördük. Dolayısı ilə, 2 adil şahidin və ya bir kişi ilə 2 qadının şahidliyi olmadan hökm vermirik."[1]

Yenə o, yağışlı gecələrdə Hunasira'dakı (Hələbə bağlı kiçik bir qəsəbə) evində, stəkanından boşalırcasına yağış yağarkən belə, məğriblə işanı qəti olaraq cəm etməmişdir.

3. Bunlar kimi digər bir xüsus da budur:

Mədinə əhli, qadının, hələ vədəsi gəlməmiş olan mehrini (mehrin bəlli bir vədəyə bağlanmış qismini), istədiyi vaxd istəyə biləcəyinə və bu halda mehrin, özünə verilməsi gərəkdiyinə hökm etmişlərdir.

---

1 Bu ifadədən, Ömər b. Əbdu'l-Əziz'in, sünnətlə sabit bir hökmü, insanların tətbiqatlarını əsas alaraq tərk etdiyi kimi bir nəticə çıxarılmamalıdır. Onun qəsd etdiyi, Şamlıların, bir şahid və haqq sahibinin andı ilə hökm verilə bilməyəcəyi mövzusundakı dəlillərlə əməli tərcih etməsidir. Mövzu haqqında təfsilatlı bilmək üçün bax: Kəşmiri, "əl-Arfu'ş-Şəzi şərh-u sunəni't-Tirmizi", III, 76 və davamı, (Mahmud Şakir təshihi ilə), Daru İhyai't-Turasi'l-Arabi, Beyrut, 1425/2004); Təhanəvi, "İlau's-Sunən", XV, 358 və davamı

Bu mövzuda İraqlılar da, Mədinəlilərə müvafiq davranmışlardır. Misirlilərə və Şamlılara gəlincə, nə səhabədən, nə də daha sonra gələnlərdən hər hansı biri, qadının, müəyyən bir tarixə buraxılmış mehrini, istədiyi vaxt istəyə biləcəyini söyləmişlərdir. Ancaq ölüm və ya boşanmaq bəhs mövzusu olarsa, bu mehir qadına verilir.

4. Mədinəlilərin "ila" mövzusundakı[1] görüşü də belədir.

---

1 *"--- Qadınları ilə yaxınlıq etməməyi and içənlər üçün gözləmə müddəti dörd aydır. Əgər onlar fikirlərindən dönsələr, əlbəttə ki, Allah Bağışlayandır, Rəhmlidir.*

*Əgər onlar boşanmaq qərarına gəlsələr, şübhəsiz ki, Allah Eşidəndir, Biləndir!»* **(Bəqərə/226-227)**

ayətlərində ifadə buyurulan haldır ki, kişinin müəyyən bir müddət boyunca və ya bir zaman məhdudiyyəti qoymadan, zövcəsinə yaxınlaşmamağa and içməsidir.

Kişi "ila" etmiş və hər hansı bir müddət tələffüz etməmişsə, Quranın gətirdiyi 4 aylıq müddət dolmadan zövcəsinə yaxınlaşarsa, and kəffarəti ödəməsi lazımdır.

Zövcəsinə yaxınlaşmazsa, 4 ayın sonunda bir bain talaq (boşanmadan istifadə edilən sözləri söylər-söyləməz, evliliyi sonlandıran boşama) meydana gəlir.

Daha əvvəl, bəynunət-i kübra (ər və arvadın qəti və bir daha geri dönüb evlənilə bilməyəcək şəkildə boşanmasını) gərəkdirəcək şəkildə bir boşanma baş verməmişdirsə, nigahın yenilənməsi ilə evlilik davam edər.

Qaynaqlarda bu mövzu belədir:

Cahiliyyədə kişi "ila" etdiyi zaman, bu, o anda gerçəkləşən bir bain talaq olaraq qəbul edilirdi. İslam bu tətbiqatı qismi bir müdaxilə ilə 4 ay sonra meydana gələcək bir bain talaq olaraq hökmə bağlamışdır.

Bir digər rəvayətə görə də, cahiliyyədə "ila" müddəti illərlə davam edə bilirdi. Ər, arvadına qəzəbləndiyi zaman, bir, iki və daha artıq davam edə biləcək şəkildə "ila" edir, istədiyi vaxt ikinci bir "ila" daha edərək, uzun illər qadını gözlədə bilirdi.

"İla" müddətində evlilik əqdi davam etdiyi üçün, bu müddət içində qadın, bir başqası ilə evlənə də bilmirdi. Quran bu müddəti 4 aya endirərək, bu halın

Onlara görə (Quranla müəyyənləşdirilən) 4 aylıq müddət keçmiş olsa belə, "ila" edən kişi, zövcəsinə geri dönmək və ya onu boşama seçimlərindən birisini tərcih etməyə (qadı tərəfindən) məcbur edilmədikcə, o şəxs, xanımını boşamış sayılmaz.

Mənə Nafi, Abdullah b. Ömər'in

-ki, Abdullah b. Ömər, ila'nın üzərindən 4 ay keçdikdən sonra, kişinin, bəhsə mövzu olan seçimlərdən birini tərcih etməyə məcbur edilməsi gərəkdiyi rəvayətinin özündən nəql edildiyi səhabədir-

Allahın kitabında zikr edilən 'ila' haqqında belə dediyini nəql etdi:

"(4 aylıq müddət dolduğunda) "ila" edən kimsənin, Allahın əmr etdiyi kimi ya zövcəsinə geri dönməsi və ya boşamağı qətiləşdirməsi xaricində bir şey etməsi halal deyildir."

Sizlər isə, belə deyirsiniz:

"İla edən kimsə, Allahın kitabında zikr edilən müddət dolduqdan sonra gözləyərsə və zikr edilən seçimlərdən birini tərcih etməyə məcbur edilməsə, zövcəsini boşamış sayılmaz."

Halbuki, Osman b. Affan, Zeyd b. Sabit, Qabisa b. Zueyb və

---

önünə keçmişdir.

• Hənəfilər, «ila» edən kişi, 4 ay müddət ərzində, zövcəsinə geri dönməzsə, bu müddətin sonunda bir bain talaqın meydana gələcəyi görüşündədirlər.

• Malikilər, Şafilər və Hənbəlilərsə -imam Leys'in ifadələrində də keçdiyi kimi- belə demişlərdir:

4 ay keçdikdən sonra, kişidən, öz yoldaşını boşaması və ya ona geri dönməsi mövzusunda bir qərar verməsi (məhkəmə qadısı tərəfindən) istənilir. Sadəcə 4 aylıq müddətin keçməsi ilə ayrılıq meydana gəlmiş olmaz. (bax: ibn Abdi'l-Bərr, "əl-İstizkar", XVll, 87 və davamı)

əbu Sələmə b. Abdirrahman b. Avf'dan nəqlən bizə çatdığına görə, onlar "ila" mövzusunda belə demişlərdir:

"İla üzərində 4 ay keçərsə, bu, bir bain[1] talaqdır."

Səid b. əl-Musəyyəb, əbu Bəkr b. Abdirrahman b. Hişam və ibn Şihab da:

"4 ay dolunca, bir (rici) talaq gerçəkləşmiş olur. Kişinin, istəyərsə, iddət müddəti içində zövcəsinə geri dönmək haqqı vardır." demişlərdir.

---

1 Rici talaq: Nigahı yeniləmək gərəkdirməyən geri dönüşlü boşanmadır.

Bir talaqın rici talaq ola bilməsi üçün, aşağıdakı 6 şərtin olması lazımdır:

1. Talaq, feli münasibətdə olmuş cütlüklər arasında olmalıdır. Xəlvət münasibət yerinə keçməz.

2. Kişi talaq verərkən, 3 rəqəmini açıqca və ya işarətlə tələffüz etməmiş, ima etməmiş olmalıdır. Bir kimsənin yoldaşına talaq verərkən:

'Səni 3 talaqla boşadım.

deməsi və ya 3 barmağı ilə işarət edərək:

'Səni belə boşadım.' deməsi halında, rici deyil, bain talaq meydana gəlir.

3. Bəynunəti gərəkdirməyən bir ifadə istifadə edilmiş olmalıdır. Kişi, zövcəsinə:

'Səni tərk etdim.' və ya: 'Səni bain talaqla boşadım.' deyərsə, rici talaq deyil, bain talaq meydana gəlir.

4. Boşama ləfzinə əlavə olaraq, bəynunət ifadə edən bir sifət istifadə edilməmiş olmamalıdır. Kişinin, xanımına:

'Səni böyük talaqla boşadım.' və ya 'Səni şiddətli talaqla boşadım.' deməsi, belədir. Bu halda da, bain talaq meydana gəlir.

5. Talaq bir şeyə bənzədilmiş olmamalıdır.

'Səni bu dağ kimi boşadım.' kimi bir ifadə istifadə edilmişsə, bain talaq meydana gəlir.

6. Talaq bir qarşılıqdan dolayı verilmiş olmamalıdır. Söz gəlişi, qadının, boşanmaq istədiyi kişiyə, maddi bir qarşılıq təklif etməsi (hul') belədir.)

5. Bir digər məsələ də budur:

Zeyd b. Sabit belə deyirdi:

“Kişi, qadına: (“İş sənin əlindədir” kimi təmlik ifadə edən bir ləfzlə) boşanma səlahiyyəti verərsə, qadın da ərini tərcih etsə, bu, bir tək talaq sayılır. Bu qadın, özünü 3 talaqla boşasa, yenə bir tək talaq gerçəkləşir.”

Abdulməlik b. Mərvan da belə hökm vermişdir. Rəbi’a b. əbi Abdirrahman’ın görüşü də, bu doğrultudadır.

Halbuki insanlar (alimlər) demək olar ki, görüş birliyi halında demişlərdir ki, belə bir qadın, əri ilə evliliyi davam etdirməyi tərcih edərsə, talaq gerçəkləşməz.

Əgər (boşanma səlahiyyəti verilən qadın), özünü bir və ya 2 talaqla boşayarsa, kişinin o qadına bir dəfə dönmək haqqı vardır.

Əgər o qadın, özünü, 3 talaqla boşayarsa, ərindən bain talaqla boşanmış olar və bir başqa kişi ilə (normal bir şəkildə) nigahlanıb cinsi münasibətə girdikdən sonra (bu ikinci) əri ölmədikcə və ya onu normal bir şəkildə boşamadıqca, əvvəlki əri ilə evlənməsi haram olar.

Ancaq ilk ər, zövcəsinə talaq səlahiyyəti verdiyi məclisdə:

“Sənə ancaq tək talaq haqqı vermişdim.”

deyərsə, bu halda, o kişiyə (ərinə tək talaqla boşanma haqqı verdiyinə dair) and içdirilir və özünə, xanımına geri dönmək imkanı verilir.

6. Abdullah b. Məsud (radiyallahu anh) belə deyərdi:

“Bir kimsə bir cariyə ilə evlənər, sonra da o cariyəni əri olaraq satın alarsa, o kimsənin o cariyəni satın alması, 3 talaq yerinə keçər.”

Rəbia da belə deyərdi.

Azad bir qadın bir qul ilə evlənər, sonra da onu satın alarsa, yenə bunun kimi olar (3 talaq meydana gəlmiş olar).

Sizdən bizə bir qisim mövzularda fətvalar verdiyinizə dair xəbərlər gəldi ki, onları qınadım. Daha əvvəl onların bir qismini sənə yazmışdım. Ancaq məktubuma cavab vermədin. Yazdıqlarımın sənə ağır gəldiyi qayğısı daşıdığım üçün, qınadığım o məsələlər haqqında və görüşünü bilməyi arzu etdiyim mövzularda, sənə yazmağı tərk etdim.

7. Eşitdiyimə görə, Züfər b. Asim əl-Hilali'yə (Abbasi xəlifəsi əl-Mehdi'nin Mədinə valisinə) istisqa (yağış duası) namazı qılacağı zaman, namazı xütbədən əvvəl qılmasını əmr etmisən. Bu davranışın mənə ağır gəldi. Çünki istisqa xütbəsi ilə namazı, eynilə cümə xütbəsi ilə namazı kimidir (yəni xütbə namazdan əvvəldir).

Bu fərqlə ki, istisqada imam xütbəni bitirdiyi zaman üzünü qibləyə dönüb dua edər, cübbəsini çıxarıb içini çevirərək geyər, sonra namaza keçər.

Ömər b. Əbdiləziz, əbu Bəkr b. Muhammməd b. Amr b. Hazm və daha başqaları da, yağış duasına çıxmış və hamısı da xütbəni namazdan əvvəl oxumuşlardır.

İnsanlar (alimlər), Züfər b. Asim'in bu davranışını qəribsəmiş və xoş qarşılamamışdırlar.[1]

---

1 • imam əbu Hənifə'yə görə, istisqada namaz şərt deyildir. İmam və camaat bərabərcə dua edər və dönərlər.

• imam Muhammməd bu məsələdə imam Malik'lə eyni görüşdədir. Onlara görə, namaz, xütbədən əvvəldir.

• Şafilərə görə, əvla olan, Hənbəlilərə görə də tərcihə uyğun olan budur.

Xütbənin namazdan əvvələ alınması, Hənbəli məzhəbi içində tərcih edilməyən bir görüş olaraq, Şafilər tərəfindən də əvla olana zidd görüş olaraq yer tapmışdır. (bax: "əl-Məvsuatu'l-Fiqhiyyə", III, 311)

8. Bir başqa məsələ də budur:

Eşitdiyimə görə, 2 şərikdən hər birinin hissəsi tək başına zəkat gərəkdirəcək miqdara çatmadıqca, onların zəkat verməsi gərəkmədiyini söyləmisən.

Halbuki, Ömər b. əl-Xattab'ın məktubunda, belə ortaqların zəkat verməsi gərəkdiyi və ortaqlardan hər birinin, öz hissəsi nisbətində bu vəzifəni yerinə gətirəcəyi bildirilməktədir.

Sizin torpaqlarda Ömər b. Əbdüləziz'in və daha başqalarının valiliği dövründə tətbiq edilən bu idi. Yəhya b. Səid'in mənə xəbər verdiyi də budur ki, o, öz dövründə alimlərin iləri gələnlərindən aşağı biri deyildi. Allah ona rəhmət etsin, bağışlasın və məqamını cənnət etsin.

9. Yenə eşitdiyimə görə, belə demisən:

"Bir kimsə birindən bir mal alıb, qarşılığının bir qismini ödəmiş yaxud aldığı malın bir qismini xərcləmiş və daha sonra iflas etmiş olarsa, satıcı, onun malından nə taparsa, onu alar."

Halbuki insanların (alimlərin) tətbiqatı belədir:

Satıcı, öz pulunun bir qismini almışdırsa və ya müştəri malın bir qismini istifadə etmişdirsə, bu, artıq əvvəlkinin eynisi deyildir.

10. Eyni şəkildə, Peyğəmbər (sallallahu aleyhi və səlləm)'in, "(birdən çox atla cihada qatılan) Zubeyr b. əl-Avvam'a, yalnız bir atı üçün qənimətdən hissə vermişdir", deyirsən.

Halbuki, hər kəs Allah rəsulu (sallallahu aleyhi və səlləm)'in ona, 2 atı üçün 4 hissə verdiyini, üçüncü atı üçünsə, bir şey vermədiyini rəvayət edirlər!

Ümmətin bütünü, Şamlılar, Misirlilər, İraqlılar, İfrikiyyə'lilər (bu günkü Liviya sərhədindən başlayıb Mərakeş'ə qədər uzanan bölgənin əvvəlki adı) bu hədislə əməl edirlər. Bu

mövzuda ixtilaf halında olan heç kim yoxdur. Bu etibarla -əsas aldığın o rəvayəti, haqqında razı olunan bir kimsədən eşitmiş olsan belə- Ümmətin bütününə müxalifət etmək uyğun deyil. [1]

Bunlara bənzəyən bir çox məsələni də sənə yazmadım. Allahın səni müvəffəq etməsi və ömrünü uzun qılması, məni sevindirər. Çünki bunda insanlar üçün mənfəət olduğunu umuram. Hər nə qədər bir birimizdən uzaq yerlərdə isək də, sənin varlığına alışdığım üçün, sənin kimi birinin (vəfat edib) aramızdan ayrılmasını, bir itki olaraq görər və bundan qorxaram.

Sənin mənim nəzərimdəki yerin və mənim sənin haqqındakı görüşüm, bax belədir. Bunu qətiliklə belə bil və məni səndən, sənin və əhlinin əhvalından xəbərsiz buraxma.

Ayrıca, sənin və ya sənin vasitənlə gələn hər hansı birinin bir ehtiyacı olarsa, mənə bildirərsənsə, bundan məmnun olaram.

Sənə bu sətirləri yazdığım əsnada, biz, həmd olsun, yaxşıyıq. Allahdan, ehsan etdiklərinə qarşılıq, sizi və bizi, Özünə şükürlə ruziləndirməsini, bizə bəxş etdiyi nemətlərini tamamlamasını diləyirik.

Allahın salamı və rəhməti üzərinə olsun.

## 4. Müsəlmanın fiqhi ixtilaflar qarşısındakı mövqeyi:

Müsəlmanın ixtilaflı məsələlər qarşısındakı mövqeyini 2

---

1 Malikilər, Şafilər, imam əbu Hənifə, imam Muhamməd və Züfər, cihada birdən çox atla qatılan mücahidin, atlarından sadəcə birinə, qənimətdən hissə veriləcəyini söyləmişdir.

İmam əbu Yusuf ilə Hənbəlilərə görə isə, döyüşdə birdən çox atla iştirak etmiş olan qazinin, sadəcə 2 atına hissə verilir, ikidən artıq ata, hissə verilməz. (bax: «əl-Məvsu’atu Fiqhiyyə», XXXl, 313)

cəhətdən incələmək mümkündür:

1. İxfilaflı məsələlərin təbiətini və qaynağını anlamaq və məşruluğunu qəbul etmək.

2. İxtilaflı məsələləri qəbul və gərəyincə əməl etmək.

Müsəlmanın, fiqhi ixtilaflar mövzusunda ilk maddədə zikr edilən halı, Sələf və sonra gələn alimlərin əksəriyyətinin sərgilədikləri davranışı -ki, bir əvvəlki başlıq altında təfsilatlı olaraq görmüşdük- mənimsəməsi gərəkdir.

İkinci maddədə zikr edilən hala gəlincə, insanın elmi və fiqhi səviyyəsinə görə fərqlilik göstərəcəyində şübhə yoxdur. Çünki insan ya alim və ya avam yaxud mütəallimdir (tələbədir); dördüncü bir variant yoxdur.

Bu məsələ üzərində durarkən, insanın bu 3 sinifdən birinə daxil olacağı həqiqətini görməzdən gəlmək və bunların bütününün eyni hökmə tabe olacağını söyləmək, ifrat və ya təfrit olacaqdır. İnsanların bütününü alimlər və ya müctəhidlər səviyyəsinə yüksəltmək caiz ola bilməyəcəyi kimi, bütününü müqəllid avam səviyyəsində görmək də caiz deyildir.

Belə bir şey etmiş olarsaq, elmə və elm əhlinə zülm etmiş, alimlə cahili bir tutmuş olarıq.

«De ki, ‘Heç bilənlərlə bilməyənlər bir olar mı?» (Zümər/9)

İndi bu 3 sinfin ixtilaflı məsələlər qarşısındakı mövqeyini görməyə çalışaq:

**4.1. Alim:** Bu kəlimə ilə, dəlillərdən hökm çıxaran -müxtəlif ictihad dərəcələrindəki- müctəhidi qəsd edirik.

Bu sinifə girən bir kimsənin, haqq olaraq gördüyü görüşlə əməl etmiş olmaq üçün, ixtilaflı məsələlər üzərində düşünməsi,

dəlilləri dəyərləndirməsi, istinbat və tərcih nöqtəsində ictihad etməsi qaçılmazdır.

Gəldiyi nəticədə başqaları özünə müxalif olsa belə, bu hökm dəyişməz. Çünki alimlərin əksəriyyətinə görə, bu səviyyədəki insanın başqasını təqlid etməsi, caiz deyildir.

Bəziləri belə demişdir:

«Bu haldakı insanın, özündən daha alim birini təqlid etməsi caizdir; özü ilə eyni səviyyədəki birini təqlid etməsi isə, caiz deyildir.»

Bu tərz bir görüş imam Muhammməd b. əl-Həsən əş-Şeybani'dən nəql edilmişdir. [1]

Xatib əl-Bağdadi, «əl-Fəqih və'l-Mutəfəqqih» (II, 71) isimli əsərində belə deyir:

«Allah Taala, elmi, övliyası üçün (Özünə yaxınlaşmada) vəsilə qılmış, asfiyasından[2] seçdiklərini elmlə qorumuşdur.

Bundan dolayı, elm yoluna girmiş olanların, bütün səylərini elmi əldə etmək üçün sərf etmələri gərəkdir.

Elm əhli arasında, elmin mühafizəsi nöqtəsində yaxınlıq, fiqhi məsələlərin istinbatında isə, fərqliləşmələr mövcuddur.»

Necə ki, alimlərin çoxu, şəri əhkamın istinbatında müctəhidlərdən günahın qaldırıldığını, əksinə, ictihadında xəta edən müctəhidə bir, isabət edənə isə, 2 savab veriləcəyini söyləmişlərdir. Onların bu mövzudakı dayanaqları, Amr b. əl-As (radiyallahu anh)'ın rəvayət etdiyi bu hədisdir:

«Hakim hökm verərkən ictihad edər və ictihadında haqqa

---

*1 bax: imam Ğazzali, «əl-Mustəsfa», II, 384, əl-Matbaatu'l-Əmiriyyə, Bulak, 1322/1904*

2 Asfiya: Saflıq, təqva sahibi və Peyğəmbərə varis olub, Onun sünnətlərini, məqsədlərini tətbiqə çalışan mühəqqiq kimsələr

isabət edərsə, 2 savab alar.

Hökm verərkən ictihad edər və ictihadında xəta edərsə, 1 savab alar.»[1] [2]

---

1 *Buxari, Təmənni/21; Muslim, Aqdiyə/15; əbu Davud, Aqdiyə/2)*

2 Hədisin geniş izahı:

Bu hədis, Kütüb-ü Sittə’nin hamısında Amr b. əl-As (radiyallahu anh) ilə əbu Hureyrə (radiyallahu anh)’dan rəvayət edilmişdir.

İmam əbu’l-Həsən əs-Sindi (əl-Hənəfi), hədisin açıqlaması bölməsində belə deyir:

«Xülasə, hakimin etməsi gərəkli olan şey, doğru və haqqı tapmaq üçün, var gücü ilə çalışmasıdır. Buna rəğmən xəta edərsə, məzur (üzrlü) sayılır.

Bəli, doğrunu tapa bilər və buna müvəffəq olarsa, 2 savab qazanar:

«İctihad savabı və haqq ilə hökm etmə savabı.»

Əks təqdirdə, yalnız ictihad savabı qazanar.

Bu nöqtə qaldı:

Hədisdə sözü edilən ictihad:

1. Şəri dəlillərdən hökm çıxarmaq ictihadı mı; yoxsa

2. Bir birinə qarşı tərəflər arasında mübahisə mövzusu olan hadisənin mahiyyətini anlayıb, həqiqətə uyğun hökm vermək üçün səy göstərib çalışması mı?

Alimlərin əksəriyyəti, buradakı ictihadı, birinci məna ilə açıqlamışlardır.

Lakin bu hədis, ictihad etmənin caizliyinə dəlil ola bilməz. Çünki ikinci şəkildə də açıqlana bilər.»

Nəvəvi də bu hədisin şərhində belə deyir:

«Bu hədisin şəriətə uyğun hökm verməyə əhil və dini məlumatları ilə «mücəhhəz» (təchiz edilmiş) alim olan hakim haqqında olduğuna dair, müsəlmanların icması vardır.

Bu özəllikdəki alim, Allahın hökmünə uyğun və isabətli qərar verdiyi zaman, 2 savab qazanar.

Savablardan biri, ictihadından dolayıdır, digəri də İlahi hökmə uyğun və isabətli qərar verməsindən dolayı.

Haqqında danışdığımız hakim, verdiyi hökmdə yanılarsa, etdiyi ictihadından dolayı 1 əcr qazanar.

Alimlər belə demişlərdir:

Bir hakim, Allahın hökmlərinə görə qərar verməyə əhil və ləyaqətli deyilsə, hökm verməsi halal deyildir.

Buna rəğmən hökm verərsə, bir savab qazanması, bəhs mövzusu deyildir və hökmü də tətbiq edilməz. Verdiyi hökmdə isabət etmiş olsa belə, hal budur. Çünki bu isabət təsadüfən olmuşdur. Şəri bir əsasa bağlı deyildir. Bu etibarla, bütün hökmlərində günahkar sayılır. Verdiyi hökmlər məqbul sayılmaz və özü də məzur (üzrlü) deyildir.»

Nəvəvi daha sonra:

Əbu Haşim (radiyallahu anh)'dan rəvayət edilən:

«Hakimlər üçə ayrılır. İkisi atəş (yəni cəhənnəm)'dədir. Biri də cənnətdədir.

1. Haqqı bilib bununla hökm edən adam, cənnətdədir.

2. Haqqı bilmədiyi halda insanlara hakimlik edən adam, atəşdədir.

3. Hökmündə zülm edən (yəni haqqı bildiyi halda batil ilə hökm edən) adam da atəşdədir.»

hədisi olmasaydı, biz deyəcəkdik ki:

'Hakim ictihad etdiyi zaman, şübhəsiz cənnətdədir.» (İbn Macə, Sünən, Kitabu'l-Əhkam, hədis no: 2315)

hədisini nəql edərək dəlil göstərir və sözlərinə davam edərək belə deyir:

«İctihad etməyə səlahiyyətli hər müctəhid, verdiyi qərarların hamısında isabətli sayılır mı?

Alimlər bu xüsusda da ixtilaf etmişlərdir:

1 Bir görüşə görə, fərqli 2 ictihaddan biri isabətli, digəri xətalı sayılır.

İsabətli olan ictihad, Allah qatındakı hökmə uyğun olanıdır. Xətalı ictihad da, Allah haqqındakı hökmə tərs düşən ictihaddır. İsabətli ictihad sahibi, 2 savab qazanarkən, xətalı ictihad edən də 1 savab qazanır. Çünki bu müctəhid də, var gücü ilə çalışaraq, həqiqəti tapmağa səy göstərmişdir. Xəta etməkdə məzur (üzrlü) sayıldığı üçün, günaha girmiş olmaz. Şafi və əshabı, bu görüşü mənimsəmişdir.

2 İkinci görüşə görə, fərqli ictihad edənlərin hamısının ictihadları və

vardıqları nəticələr, isabətli sayılır. Yəni bir-birinə tərs düşən 2 ictihad sahibinin hər ikisi də, isabətli hökm vermiş olurlar.

Hər 2 qrup da bu hədisi, özləri üçün dəlil göstərmişlərdir.

• Birinci qrupa dəlil olması açıqdır. Çünki hədis, müctəhidi isabətli və xətalı deyə ikiyə ayırmışdır. Əgər hər müctəhid isabətli sayılsaydı, xətalı deyə bir şey qalmazdı. Xətalı olmasına rəğmən, özünə savab verilməsinə gəlincə isə, bu savab, sərf etdiyi güc və çalışmasının qarşılığıdır.

• Hədisin ikinci qrupa dəlil olması isə, belə izah edilmişdir:

Bu hədis, müctəhid üçün savab mövcud olduğunu bildirməktədir. Əgər müctəhidin isabətli qərarı olmasaydı, özünə savab verilməzdi.

Hədisdə müctəhidə xətalı deyilməyinin səbəbi budur:

Əgər müctəhid, ictihad sahəsi xaricində qalan, məsələn, haqqında icma olan bir məsələ haqqında ictihad edərsə və ya etdiyi ictihad nassa müxalif olarsa, belə bir ictihad etmiş kimsə, xətalı iş görmüş olar.

(Təbii ki, bir müctəhid, bilə-bilə, nassa müxalif bir hökm verə bilməz. Bununla bərabər icmaya müxalif olan bir məsələdə belə, ictihad edə bilməz. Belə olduğu halda, etdiyi ictihad qeyri-məqbul və günahdır. Ancaq bilməyərək və yanılaraq belə bir hala düşərsə, etdiyi xətadan dolayı, üzrlü sayılır.)

Müctəhidin bəzən xətalı ictihad edə bildiyini söyləyən qrup, «fəri məsələlər haqqında edilən ictihadı» qəsd edirlər.

Tövhid əsasları ilə bağlı məsələlərdə, fərqli ictihad edənlər olarsa, bunlardan yalnız birinin ictihadının isabətli və buna tərs düşən ictihadların xətalı olduğu xüsusunda, alimlərin icması vardır.

Yəni bu fərqli ictihadların ikisinin isabətli olması, bəhs mövzusu deyildir.»

«Avnu'l-Məbud şərh-u Sunən-i əbu Davud» müəllifi Əzimabadi də, icmal olaraq belə deyir:

«Hakimin isabətli və haqlı qərar verməsindən məqsəd, vaqe olan ictihadının, Allahın hökmünə müvafiq və uyğun olmasıdır.

Xattabi, bu hədisin şərhi bölməsində belə demişdir:

'Allahın hökmünə uyğun qərar vermək üçün, var gücü ilə çalışan müctəhid, xətalı hökm verdiyində, savab qazanmasının səbəbi, ictihad etməsinin ibadət sayılmasıdır. Etdiyi xətadan dolayı, savab qazandı, deyilə bilməz. Ancaq etdiyi xətanın günahı, müctəhidin boynundan qaldırılır.'

«Müsəlmanlardan haqq əhli olanlar, şəri əhkamda istinbat edən müctəhidlərdən günahın qaldırıldığı mövzusunda ittifaq etmişlərdir.

Bişr əl-Mərisi, ibn Uleyyə, əbu Bəkr əl-Əsamm və qiyası inkar edən Zahiriyyə və (şiələrdən) İmamiyyə kimi firqələr isə, hər məsələdə haqqın bəlli olduğunu və haqqı göstərən

---

«əl-Fəthu'l-Bari» müəllifi Asqalani, Xattabi'nin bu sözündən çıxan nəticə haqqında belə deyir:

«Xattabi'yə görə:

'Xətalı ictihad edənə bir savab vardır.'

sözündən məqsəd, o ictihadın günahının bağışlanmasıdır.»

Xətalı ictihadın günahının bağışlanması, ictihada əhil olan kimsələrə məxsusdur. Yəni:

• qiyas yollarını bilən;

• üsul elminə vaqif; və

• ictihad vasitələrinə sahib olub

ictihad etməyə layiq olan müctəhidin, bütün gücünü sərf etdiyinə rəğmən, varacağı nəticədə bəyan edəcəyi hökm, Allah qatındakı hökmə zidd düşərsə, üzrlüdür və bundan dolayı günahkar sayılmaz.

İctihad etməyə layiq olmayan kimsə, ictihad etməyə qalxmaqla, həddini aşmış olar və işlədiyi xətada üzrlü sayılmaz. Əksinə günahla qarşı-qarşıyadır. (2315 no-lu hədis, bunun dəlilidir).

İctihad etməyə layiq müctəhidin xətalı ictihadında üzrlü sayılması, fiqhi mövzuların təfərrüatına aid məsələlərə məxsusdur. Bu kimi məsələlər, müxtəlif hökmlərə və fərqli görüşlərə möhtəməl (ehtimallı)dırsa, fərqli ictihadlar edilə bilər.

Fərqli görüşlərə möhtəməl olmayan və açıq olduğu üçün hər hansı bir izaha imkan verməyən Şəriətin əsas hökmləri və təməl məsələləri haqqında ediləcək ən kiçik bir xəta, bağışlana bilməz. Zatən bu kimi məsələlər və hökmlər haqqında ictihad etmək, bəhs mövzusu deyildir.

Kitab, sünnət və ya icma ilə sabit olan hökmlər, qətidir. Bunlara tərs düşəcək bir görüş bəyanı, bəhs mövzusu deyil. Belə bir cəhdə qalxan kimsə, işlədiyi xətada üzrlü sayılmayacağı kimi, görüşü də rədd edilər.»

qəti dəlil mövcud olduğunu, dolayısı ilə haqqa isabət edə bilməyənlərin -küfür və fisqə nisbət edilmədən- günahkar olduğunu söyləmişlərdir.

Haqq əhlinin bu mövzudakı dəlili, təvatür yolu ilə nəql edilən, şəkk və şübhədən tamamən uzaq olan və zəruri elmlə bilinən bu xüsusdur:

Səhabə arasında (daha əvvəl açıqladığımız kimi) fiqhi məsələlərdə ixtilaf baş vermiş və bu ixtilaf, Səhabə əsri bitənə qədər davam etmişdir.

Hal belə ikən, onlardan hər hansı birindən, ixtilaf edənlər mövzusunda, açıq ya da qapalı nə bir qınama meydana gəlmiş, nə də ixtilaf etdiyi üçün birinin günahkar olduğunu söyləyən olmuşdur.

Halbuki, bizlər bilirik ki, hər hansı bir kimsə, 5 təməl ibadətin vacibliyinə və ya zina və adam öldürmənin haramlığına müxalifət edəcək olarsa, Səhabə, onun xətalı olduğunu və günaha düşdüyünü söyləməkdə gecikməzlərdi...»[1]

## 4.2. Avam: Bu kəlimə ilə:

• təqdirə layiq; və

• dəlilləri dəyərləndirə biləcək qədər

bir elm öyrənə bilməmiş cahil kimsələri qəsd edirik.

Belə kimsələrin, alimləri təqlid etməsi qaçılmazdır. Təqlid etdiyi kimsə, istər öz məzhəbinin imamı olsun, istərsə mötəbər alimlərdən biri olsun, fərq etməz.

• Bu insan əgər bəlli bir məzhəbi öyrənir və özünü o məzhəbin hökmlərilə bağlayırsa, birinci hal;

1 *Amidi, «əl-İhkam fi Usuli'l-Əhkam», IV, 244*

• Özünü bəlli bir məzhəblə məhdudlaşdırmırsa, ikinci hal bəhs mövzusudur. Çünki onun məzhəbi, fətva soruşduğu kimsənin (müftüsünün) məzhəbidir.

Dolayısı ilə, bu insanın etməsi gərəkli olan şey, soruşmaq, fətva istəmək və aldığı fətva ilə əməl etmək, bunu edərkən də, bəhs mövzusu olan məsələ haqqında o fətvaya müxalif olan görüşlərə hörmət və təqdiri əldən verməməkdir.

Bu haldakı insanın,

«Bilmirsinizsə, zikr əhlindən soruşun.» (Nəhl/43)

ayətinin ümum ifadə edən hökmü gərəyincə, Allahın dinində öz görüş və anlayışı ilə əməl etməsi caiz deyildir. Əks halda, həvası ilə əməl etmiş olar.

Bu nöqtədə, Xatib əl-Bağdadi bunları deyir:

«...Özünə təqlidin caiz olduğu kimsəyə gəlincə, şəri əhkamın əldə edilmə yollarını bilməyən avamdır. Belə kimsələrin bir alimi təqlid və onun görüşü ilə əməl etməsi caizdir. Çünki Allah Taala:

'Bilmirsinizsə, zikr əhlindən soruşun.' buyurmuşdur...

...Mötəzilədən bəzisinin belə dediyi nəql edilir:

'Avamın, alimin görüşü ilə -illətini bilmədən- əməl etməsi caiz deyildir. Bir kimsə bir alimə bir məsələ soruşduğu zaman, ona, verdiyi hökmə yetişmə yollarını soruşmuş olur. O da, o hökmə varma yollarını ona öyrətdiyi zaman, avamdan olan kimsə, məsələyə vaqif olar və o görüşlə əməl edər.'

Bu, xətalı bir görüşdür. Çünki avamın:

• illərcə fiqh təhsil etmədən;

• uzun zaman fəqihlərlə həmhal olmadan;

• qiyas etməyin yollarını; və

• hansı hallarda qiyasın səhih, hansı hallarda fasid olduğunu;

• dəlillərin hansının əvvələ alınıb hansının geriyə buraxılması gərəkdiyini öyrənmədən,

hökm istinbatının yollarını bilməsi, mümkün deyildir.

Avamın belə bir şeylə mükəlləf qılınması, güc yetirə bilməyəcəyi bir şeylə mükəlləf qılınması deməkdir. Bunu yerinə yetirmələri imkansızdır...» («əl-Fəqih və'l-Mutəfəqqih», ll, 68-69)

Sözün burasında, Xatib əl-Bağdadi'nin:

«Özünə təqlidin caiz olduğu kimsəyə gəlincə...»

və

«Belə kimsələrin bir alimi təqlid və onun görüşü ilə əməl etməsi caizdir.»

tərzindəki sözləri haqqında xəbərdarlıq etmək istəyirəm:

Bu cümlələrdə keçən «cəvaz»ın, terminoloji mənada muxayyərlik ifadə edən ibahə mənasına gələcəyini söyləmək, doğru deyildir. Çünki Xatib əl-Bağdadi'nin sözlərində də açıqlamasını tapdığı kimi,

«Bilmirsəniz, zikr əhlindən soruşun.»

ayətinin ümum ifadə edən hökmü gərəyincə, avamın bir imamı təqlid etməsi vacibdir. Bu ayətdəki əmr, bu vacibliyin dəlilidir.

Alimlərin bu kontekstdə «vaciblik» yerinə «cəvaz» təbirini istifadə etməsi, möhtəmələn avamın başqasını təqlidini əngəlləyənlərin -necə ki, Xatib əl-Bağdadi, bunu mötəzilədən bəzisindən nəql etmişdi- bu görüşünü rədd sədədində danışır olmalarından iləri gəlməktədir.

Dolayısı ilə, burdakı «cəvaz» ilə, «qadağa» təbirinin əks

mənası qəsd edilmiş olmaqdadır.

Avamın hökmü mövzusunda əl-Amidi'nin, Üsul'unda keçən bu ifadəsi daha açıq və dəqiqdir:

«Bağdad mötəziləsindən bəziləri, avamın müctəhidə tabe olmasını əngəlləmiş və:

«Müctəhidə tabe olmaq, ancaq müctəhidin ictihadının səhih olduğunu, dəlili ilə bildikdən sonra caiz olur.» demişlərdir.

əl-Cübbai'nin də, 5 təməl ibadət kimi xüsusların xaricində qalan ictihadi məsələlərdə, bunu mübah gördüyü nəql edilmişdir.

Tərcih edilən, (mühəqqiq üsulçulara aid olan) ilk görüşdür. Nass, icma və ağıl da buna dəlalət etməkdədir.

• Bu mövzudakı nass:

«Bilmirsinizsə, zikr əhlindən soruşun.»

ayətidir. Bu ayət, bütün muxatabları ehtiva edən ümumi bir ifadəyə sahibdir. Bu etibarla, bilinməyən hər şeyin soruşulması, dolayısı ilə, üzərində anlaşılmazlıq mövcud olan məsələni də ehtiva etməsi gərəkdir...»

• «İcmaya gəlincə, Səhabə və tabiun vaxtlarında, müxalif görüşlər ortaya çıxmazdan əvvəl, avam, müctəhidlərdən fətva soruşar, şəri hökmlərdə onlara tabe olarlardı. Alimlər də dəlil zikr etmədən və onları dəlili zikr edilməmiş görüşlərlə əməldən əngəlləmədən, onlara yerindəcə cavab verərlərdi. Bu halı qınayan da olmazdı. Bu surətlə, avamın müctəhidə tabe olmasının mütləq caiz olduğu mövzusunda, icma hasil olmuşdur.»

• «Əqli dəlil isə, budur:

İctihada əhil olmayan kimsə, hər hansı bir fəri hadisə meydana gəldiyi zaman, ya hər hansı bir şəkildə əməl

etməyəcək -ki, bu, bir birinə qarşı olan tərəflərin bütününün icmasına ziddir- və ya əməl edəcəkdir. Əməl edəcəyi zaman da, ya hökmü təsbit edən dəlillə və ya təqlidlə əməl edəcəkdir.

Dəlillə əməl etməsi, mümkün deyildir. Çünki bu, gərək o kimsəni, gərəksə bütün insanları, hadisələrin/hökmlərin dəlillərini dəyərləndirmə məcburiyyətinə, dolayısı ilə məişətini təmin etməkdən geri qalmağa, dünyanın xarab olmasına, əkin və nəslin zay olmasına yol açacaqdır, ki, bu halda ictihada da, təqlidə də yer qalmayacaqdır. Bu isə:

«...dində də sizin üçün heç bir çətinlik yaratmadı...» (Həcc/78) ayətində

və:

«İslamda (başqasına) zərər vermək və (zərərə) zərərlə qarşılıq vermək yoxdur.»[1]

hədisində nəfy edilən «çətinlik və zərər vermə»yin əhatə dairəsinə girər.

Bu ayət və hədis, «çətinlik və zərər vermə»yin hər növünə şamil ümumi nasslardır. Çünki gərək ayətdəki «çətinlik» kəliməsi, gərəksə hədisdəki «zərər vermək» ifadəsi, nəkirə (qeyri müəyyən)'dir və nəkirə, nəfy kontekstində gəldiyi zaman, zəruri olaraq ümum ifadə edər.

Bu qədər var ki, biz, Üsuluddin (əqidə) məsələlərində təqlidin mümkün olmaması xüsusunda, bu ümumi hökmə müxalifət etməkdəyik. Üsuluddin məsələlərində təqlidin burdakından fərqli olaraq mümkün olmadığı mövzusunda, daha əvvəl açıqlama vermişdik.

Yeni meydana gələn fiqhi hadisələr, təqlidin mümkün olmadığı söylənilən Üsuluddin məsələlərindən qat-qat artıqdır. Dolayısı ilə, fiqhi məsələlərdə hər kəsi ictihad etməklə məsul

---

1 *İbn Macə, Əhkam/17*

tutmaq, çətinliyi daha çox artırmaq deməkdir.

Bu səbəblə, Üsuluddin sahəsinə girən məsələlər xaricində, ictihadi olan və olmayan məsələlər haqqında ümumi olan dəlilin gərəyi ilə əməl etmiş olmaqdayıq...»[1]

**4.3. Mütəallim (tələbə):** Bu kəlimə ilə, elmi səviyyə olaraq avamın üstündə, müctəhidin altında olan kimsəni qəsd edirik.

Bir kimsə elmdən və mərifətdən bir miqdar şey əldə etdiyi zaman, avam dərəcəsindən yuxarı çıxar, ancaq bu, onu müctəhidin səviyyəsinə yüksəldə bilməz. Muhamməd (sallallahu aleyhi və səlləm) ümmətinin, şəri elmlərdə mütəxəssis olmuş, elm və təhsilə əhəmiyyət verən alimlərinin əksəriyyəti, bu kateqoriyaya aiddir.

Şübhə yoxdur ki, bu kateqoriyaya girənlər, avamın dərəcəsi ilə ictihad dərəcəsi arasında bir-birindən fərqli bir çox dərəcəyə ayrılırlar.

Dolayısı ilə, alimlərin bunlar haqqındakı hökmləri və ixtilaflı məsələlərdəki mövqelərinə dair bəyanları da, bir-birindən fərqlidir. Hətta bəzi alimlərin bu nöqtədəki ifadələrinin ümumundan, onların mütləq surətdə başqasını təqlid etməsi gərəkən avam sinfinə daxil ediləcəyi anlaşılmaqdadır.

Digər bəzi alimlərin ifadələri isə, bunlarla avamın bir tutulmaması, bunların dəlillər haqqında hökm yürütməsinə və ixtilaflı məsələlərdə tərcihə uyğun gördükləri dəlili seçmələrinə, xoş görü göstərməsi yönündədir.

Bunlar haqqındakı hökmün (ümumiləşdirilmədən) dəqiq bir surətdə verilməsini gərəkdirən səbəb, dərəcələrinin, elmi səviyyələrinin və əhvallarının fərqliliyidir.

---

1 *Amidi, «əl-İhkam», IV, 306-308*

Buna bir də onların bir qisminin elmi səviyyəsini digərinə qiyas etməyimizi və bu yolla onları, o və ya bu dərəcəyə daxil etməmizi mümkün qılacaq dəqiq ölçülərin kamil mənada mövcud olmadığı həqiqətini də, əlavə etmək lazımdır.

Bununla birlikdə bu kateqoriyaya girənlərin hallarını təsbitdə, görüşlərin ixtilaf etdiyi və üzərində durduğumuz nöqtəyə, dolaylı da olsa bağlı olan üsuli bir məsələ haqqındakı icmali bir tədqiqat aparmaq, bizə kömək edə bilər. Sözünü etdiyimiz məsələ budur:

## İctihad bölünə bilərmi?

Bu sualda ifadə edilən halı belə aça bilərik:

Hər hansı bir kimsə, bir məsələdə ictihad əhliyyətinə sahib olduğu və o məsələdə ictihadı ilə vardığı nəticə, başqa müctəhidlərin ictihadına müxalif düşdüyü zaman, bu kimsə, o ictihadı ilə əməl edə bilərmi? Yoxsa bu kimsə başqasını təqlid etmək məcburiyyətindədirmi?.

Bir qrup bu suala:

«Madam ki, o məsələdə ictihad etmiş və ictihad əhliyyətinə sahib olmuşdur, elə isə, ictihadı ilə əməl etməsi gərəkdir.»

diyə cavab vermişdir.

Digərləri isə, belə demişlərdir:

«İctihadın bölünməsi caiz deyildir.»

hökmü gərəyincə, o kimsənin başqasını təqlid etməsi gərəkdir.

Alimlər bu görüşlərin hansının tərcih edilməsi gərəkdiyi nöqtəsində də ixtilaf etmişlərdir.[1]

Qənaətimə görə, bu məsələ, üçüncü qrupu təşkil edən

1 *Amidi, «əl-İhkam», IV, 270-5*

mütəallimdən çox, birinci maddədə keçən müctəhidlə bağlıdır. Çünki üçüncü qrupun ictihad dərəcəsinə çata bilməyən və elmi səviyyəsi doğrudan hökm istinbatına yetməyən kimsələrdən meydana gəldiyini görmüşdük.

Bu məsələdə mübahisə edən alimlərin məqsədinin isə, müctəhidlə bağlı olduğu anlaşılmaqdadır. Bu səbəblə, sadəcə bu nöqtəyə işarət etməklə kifayətləndim və məsələni təhqiqə gərək görmədim. Bu məsələnin təfsili, üsul kitablarının bağlı bölmələrində görülə bilər.

Bununla birlikdə, bir qisim alimlərin bu məsələ üzərində durarkən yer verdikləri bəzi ifadələrə vaqif oldum ki, üzərində durduğumuz xüsusun izahında ehtiyac duyduğumuz bəyanı ehtiva etməkdədir.

Bu cümlədən olaraq, imam Ğazzali, «əl-Mustəsfa»da belə deyir:

«Bu (qrupa girənlər) müctəhid deyildir. Ancaq bəzi mövzularda ictihada qadir ola biləcək, bəzilərində isə, elm təhsili olmadığından, ictihad etməkdən aciz qalacaq kimsələrdir. Misal üçün, nəhvlə (ərəb dili qrammatikasını öyrənən elm) bağlı bir məsələdə, bu elmin və rəvayətlə bağlı məsələdə isnadın sihhətini təsbit etmək üçün, ravilərin özəllikləri və əhvalı ilə bağlı elmin təhsili belədir.

Dolayısı ilə bu qrupa girən kimsə, bəzi elmləri öyrənmiş və o sahələrdə müstəqil olaraq hərəkət edəcək səviyyəyə gəlmişdir. Bu halıyla, o, avama bənzəməz. Ancaq o, bir digər elmi əldə etməmişdir; dolayısı ilə, o sahədə avam kimidir. Ancaq bu halı səbəbilə onun, avam sinfinə mi, alim sinfinə mi daxil ediləcəyi nöqtəsində düşünmək lazımdır.

Ən məşhur olan və doğru görünən görüş, o məsələdə, o kimsənin avam kimi olmasıdır. Müctəhid (içtihad üçün gərəkli

elmləri qüvvət-i qaribə [1] ilə bilən kimsədir.

Əgər öyrənmək üçün hələ çox yorulmağa, səy göstərməyə möhtacdırsa, o kimsə, o sahədə, aciz deməkdir. Bununla birlikdə, onun da o elmi təhsil etməsi mümkündür.

Ancaq avamın da o elmi öyrənməsi mümkündür. Ancaq bunu etmək məcburiyyətində deyildir. Dolayısı ilə, o kimsənin o mövzuda ictihadı tərk etməsi, caizdir.

Nəticə olaraq, yeni başlayan kimsənin elmdəki dərəcəsi ilə kamal mərtəbəsi arasında müxtəlif dərəcələr vardır. Bu dərəcələr haqqında fərqli şeylər söylənə bilər...»[2]

«Fəvatihu'r-Rahamut» adlı «Müsəlləmu's-Sübut» şərhinin (II, 384) sahibi, əl-Ənsari belə deyir:

«Məsələ:

Mütləq müctəhid olmayan bir kimsənin -alim olsa belə-, ictihada güc yetirmədiyi bir müctəhidi təqlid etməsi gərəkdir.

---

1 Bəzi kəlam alimlərinə görə, insanın bir mövzudakı məlumatı, ya «bilfiil», və ya «bilqüvvə» olur.

1. Bunlardan birincisi, insanın zehnində yerləşmiş və hazır olan və istənildiyi an, istifadəyə təqdim edilən elmdir. Fiqh elmini bütün babları ilə bilən və hər hansı bir şey soruşulduğunda, yerindəcə cavab verən kimsənin elmi belədir.

2. İkincisi isə, zehində qəti bir şəkildə yerləşmiş və hazır olmayan, ancaq az bir səy və ya fikir yürütməklə çatıla bilən elmdir. Buna «qüvvət-i qaribə» deyilir.

İnsan az bir səy ilə, bu mövzudakı ilk məlumatlarını inkişaf etdirərək 'bilfiil elm' halına çevirə bilər. Yəni 'qüvvə'dən (potensialdan) felə çıxara bilər. (təfsilat üçün bax: əl-İci, «əl-Məvaqif fi ilmi'l-Kəlam», 145, Aləmu'l-Kutub)

Ğazzali'nin yuxarıdakı cümləsi, müctəhidin, ictihad üçün gərəkli elmlərin bütününü hafizəsində hazır etməyən, amma bir tələbə kimi yeni başdan öyrənmək ehtiyacında da olmayan, əksinə, az bir səy ilə qaynaqlara kiçik bir müraciət ilə ehtiyac hiss etdiyi məlumata, asanlıqla çatan kimsə olduğunu ifadə etməkdədir.

2 *İmam Ğazzali, «əl-Mustəsfa», II, 384, əl-Matbaatu'l-Əmiriyyə, Bulaq, 1322/1904*

Yəni təhsil əldə edib öyrənməyə güc yetirmədiyi mövzular üçün bu, belədir; yoxsa təhsilə və ictihada güc yetirə bildiyi mövzular üçün bu, məqbul deyildir. Bu hökm, ictihadın bölünə biləcəyi görüşünə əsasən doğrudur.

İctihadın bölünmə qəbul etməyəcəyi görüşü əsas alındığında isə, belə kimsənin ictihada güc yetirdiyi məsələlərdə də, güc yetirə bilmədiyi məsələlərdə də, bir müctəhidi təqlid etməsi lazımdır. Daha əvvəl söylənənlərdən başa düşmüş olmalısan ki, bu mövzuda haqq olan ilk görüş (ictihadın bölünə biləcəyi görüşü)'dür...»

Allamə ibn Abidin (əl-Hənəfi), allamə Piri'nin «əl-Əşbah» şərhinin başlarında, ibnu'ş-Şihnə'nin «əl-Hidayə» şərhindən belə nəql etdiyini söyləyir:

«Hədis səhih olduğu zaman, məzhəbin xilafına da olsa, hədislə əməl edilir. Bu da, imamın məzhəbi olur. Belə bir halda hədislə əməl etmək, müqəllidi Hənəfi olmaqdan çıxartmaz.

İmamdan:

«Hədis səhih olduğu zaman (bildirdiyi hökm), mənim məzhəbimdir.»

dediyi, səhih olaraq sabit olmuşdur.

İbn Abdi'l-Bərr, bu sözü, əbu Hənifə və digər imamlardan nəql etmişdir.»

«...Bunu imam Şarani də, 4 imamdan nəql etmişdir.

Bunun:

• nasları dəyərləndirə biləcək;

• möhkəm nasları mənsux olanlarından ayıra biləcək

səviyyədəki əhil kimsələr üçün bəhs mövzusu olacağı açıqdır.

Bu səviyyədəki məzhəb əhli kimsələr, dəlili dəyərləndirib

onunla əməl etdiyi zaman, o hökmün məzhəbə nisbəti (o hökmün məzhəbin hökmü olduğunu söyləməsi), səhih olur. Çünki məzhəb sahibinin icazəsi ilə ortaya çıxmışdır. Çünki şübhə yoxdur ki, məzhəb imamı, dəlilinin zəifliyini bilsəydi, görüşündən dönüb qüvvətli dəlili əsas alardı...»[1]

İbnu's-Salah (əş-Şafi) (rahmətullahi aleyh) belə deyir:

«Məzhəbincə müxalif bir hədisə rastlayan bir Şafi', mütləq ictihad səviyyəsinə çatmışsa və ya bir babda yaxud bir məsələdə ictihad edə biləcək səviyyədə isə, müstəqil olaraq öz ictihadı ilə əməl edə bilər.

Əgər ictihad üçün gərəkləri şərtləri özündə daşımırsa, gərəkli olan tədqiqatı etdikdən sonra hədisə müxalifət özünə ağır gəlirsə və hədisə müxalifəti məşru göstərəcək bir cavab da tapa bilmirsə, imam Şafi xaricində bir imam da o hədislə əməl etmişdirsə, o kimsə, o hədislə əməl edə bilər. Bu, o kimsənin o məsələdə imamının məzhəbini tərkinə, üzr təşkil edər.»

Dihləvi, ibnu's-Salah'ın bu sözünü nəql etdikdən sonra belə deyir:

«Nəvəvi bu sözü gözəl görmüş və bunda da qərar qılmışdır.»[2]

Bir yandan alimlərin, ictihadın bölünmə qəbul edib-etməyəcəyi mövzusundakı ixtilafı, digər yandan avam ilə mütəallimi bir birindən ayrı tutmaq zərurəti dolayısı ilə, bu üçüncü kateqoriyanın halını, bir az təfsilatlı olaraq ələ almağın uyğun olacağını düşünürəm.

Dərəcələrinin və hallarının fərqliliyi ilə mütəallim kateqoriyasına girənlər, bu 2 haldan biri üzrə olurlar:

**A.** Özünə yetərli elmi səviyyə, tədqiqat aparma və təhsil mövzusunda əzm və qabiliyyət bəxş edilmiş olan və yetərli qaynağa sahib olan, dolayısı ilə, özündə dəlilləri incələmə və

1 *«Haşiyət-u ibn Abidin», l, 73, Daru Aləmu'l-Qutub, Riyaf, 1423/2003*
2 *Dihləvi, «əl-İnsaf», s. 66*

üzərində dəyərləndirmə edə bilmə imkanı görənlər;

**B.** Elminin yetərsizliyi, çalışmasının azlığı və ya gərəkli qaynaqlara sahib olmaması dolayısı ilə, özündə bu imkanı görməyənlər.

Birinci qrupdakılar:

• ictihad və dəyərləndirmə üçün kifayət qədər səy göstərdiyi;

• tədqiqat aparmaq və təhsil üçün var gücünü sərf etdiyi və bu surətlə vardığı nəticə mövzusunda qəlbən tətmin olduğu zaman,

tərcihə uyğun gördüyü görüşlə əməl edə bilər. Bunu edərkən, digər görüşlərə hörmət göstərməyi və o mövzuda müxalif görüş mənimsəyən alimlərə təqdiri də əldən verməməlidir.

Bu söylədiyimiz, «vaciblik» deyil, «caizlik» ifadə edər. Çünki zikr etdiyimiz bu 3 şərtə (yetərli elmi səviyyə, tədqiqat aparmaq və təhsil mövzusunda əzm və qabiliyyət, yetərli qaynağa sahib olmaq) sahib olub-olmadığı, başqaları tərəfindən bilinə bilməz. Bu səbəblə, məsələ, o kəslə Rəbbi arasında qalmaqdadır.

İkinci qrupdakılara gəlincə, zikr edilən 3 şərti özündə daşımırsa və ya o şərtlərdən birini tam olaraq yerinə gətirə bilməmişdirsə, bu halı davam etdiyi müddətcə, tədqiqatı və düşüncəsinə dayanaraq, tərcihə uyğun gördüyü görüşlə əməl etməsi caiz deyildir.

Çünki burda, tərcihi mümkün qılacaq bir faktor olmadan tərcih etmək və əhlindən ortaya çıxmayan bir tədqiqat və dəyərləndirmə bəhs mövzusudur.

Bu halda o, tamamilə avamın tabe olduğu hökmə tabe olacaqdır. Avamdan fərqli olaraq, bəzi xüsusiyyətlərə sahib olsa da, nəticə dəyişməz. Əks halda, o kimsə, bilmədiyi ilə əməl etmiş olacaqdır. Bu da onun:

«Bilmirsinizsə, zikr əhlindən soruşun.» ayətinin muxatabı olması deməkdir.

Bu halda, bu qrupa girənlərin felən mövcud olub-olmadığı məsələsi, bizim üçün əhəmiyyətli deyildir. Bunu -qəlbimiz mutməin olaraq- bilirik ki, müsəlmanların yaşadığı heç bir bölgə, heç bir zaman, elm mövzusunda istəkli, tədqiqat və dəyərləndirmə etməyi tərk etməyən, var gücü ilə səy və gücünü elm yolunda sərf edən müxtəlif dərəcələrdəki alimlərdən boş olmamışdır.

Beləcə, bu 2 faydanı əldə etmiş və bu 2 məqsədi reallaşdırmış olduq:

**4.3.1.** Mütəallim kateqoriyasına girənlərin:

• dəlilləri dəyərləndirə biləcəyi;

• elmlərinin imkan verdiyi ölçüdə tərcih və seçim edə biləcəyini

söyləmiş olduq. Bununla bərabər, hicri dördüncü əsrin başından bu yana, alimlərin, mütləq müctəhid yetişmədiyini söylədikləri zamandan bəri, üzərlərində şiddət və qüvvətini gündən-günə artıran təsirini qaldırdıq.

Bilindiyi kimi, o vaxtdan sonra, bir çox alim -əhil olmayanlar girməsin deyə- ictihad qapısının bağlandığına fətva vermişlərdir. Daha sonra bu hal, feli olaraq ümumiləşmiş və muqayyəd (bir məzhəbə mənsub) müctəhidləri və onlardan aşağı təbəqələrdə yer alan alimləri də içinə almış, hətta bir çox alim nəzdində, hər kəsin tam təqliddə tabe olduğu şəklindəki görüşünə yol açmışdır.

**4.3.2.** İctihad qapısının -bəzilərinin istədiyi kimi- 2 qanadı

üzərinə açılması, hər gələnin içəriyə girməsi və hər kəsin öz həvasını əsas alaraq fətva verməsi, dolayısı ilə, fəsad və dəlalətin yayılması mövzusunda göstərilə biləcək tənbəl davranışların önünü kəsmiş olduq.

Xüsusi ilə də, bildirmək lazımdır ki, uzun zamandan bəri, Müsəlmanlar, bu kimilərin fəsadını önləyən siyasi gücdən məhrumdurlar. Bu fəsadı dayandıracaq nə bir hakim, nə də bir səlahiyyət sahibi var...

Fərqli fiqhi məzhəblərə mənsub təhqiq əhli son vaxt alimlərinin feli varlığı, bizim vardığımız bu nəticəni qüvvətləndirən xüsuslar cümləsindən olaraq görülə bilər. Onlar bildirdiyimiz bu metodu tətbiq etməkdə, incələməkdə, dəyərləndirməkdə, elmləri və anlayışları çərçivəsində tərcih və seçim etməkdədirlər. Onlar bunu edərkən, sələfləri olan mühəqqiq alimlərin yolunu izləməkdə, gözəl və faydalı çalışmalar ortaya qoymaqdadırlar...

Son vaxt alimlərinin bəzilərinin üsul və fiqh mövzusundakı kitabları, bu metodun canlı şahididir. Müvəffəqiyyət, Allahdandır.

## 5. Zidd davranışlar haqqında xəbərdarlıq

Alimlərin ixtilaflı məsələlərdəki davranışını ərz və Müsəlmanın bu ixtilaflar qarşısında sərgiləməsi lazım olan davranışı bəyan etdikdən sonra, əvvəldən bəri bəzi insanların sərgilədiyi bəzi zidd davranışlara işarət etməyimiz lazımdır ki, Müsəlman, o mövzularda oyaq olsun və o davranışlardan çəkinsin...

Burda sadəcə bəhs mövzusu davranışı bəyan və təvsif (vəsf) etməklə kifayətlənəcək, bu davranışları sərgiləyən şəxsləri bəhs mövzusu etməyəcəyəm. Çünki bir şeyi bilmək, bizi, o

şeyin sahibini bilməkdən müstağni (tox, zəngin) qılar...

Bəhs mövzusu zidd davranışları da, biri ifrat, digəri təfrit olmaq üzərə, 2 qismə ayıracam.

## 5.1. İfrat davranışlar:

### **5.1.1.** Bir qisim avamın və məzhəb müntəsiblərinin göstərdiyi məzhəb təəssübü.

Sadəcə öz məzhəbini haqq, digərlərini batil və ya sadəcə öz məzhəbini doğru, digərlərini açıqca xətalı kimi görən bu anlayış, Müsəlmanlar arasında anlaşmazlıq və ayrılıqlara səbəbiyyət verməkdə, nifrət hislərinə yol açmaqdadır.

Bir qisim elm əhlinin bu təəssübə arxa çıxması, heyrətləndiricidir. Bəziləri də belə deyirlər:

«Mənim məzhəbim doğrudur, xətalı olma ehtimalı da vardır. Digərinin məzhəbi xətalıdır, doğru olma ehtimalı da vardır.»

Digər bir qisim də, müqəllidin belə inanması gərəkdiyini, əks halda, məzhəbini təqlidinin caiz olmadığını söyləyir...

Əgər insaf etsələr, belə deməli idilər:

«Məzhəblərin hamısı doğrudur, xətalı olma ehtimalı da vardır. Məzhəblər, məzhəb quran imamların nəzərində səhihdir/doğrudur; xətalı olma ehtimalı vardır, çünki məzhəb, şəri nasların anlaşılması və tətbiqi mövzusunda bəşəri ictihadlardan ibarətdir. Məzhəb sahibləri də, xətadan qorunmuş insanlar deyildirlər.»

Məsələnin həqiqətdəki halına gəlincə, kimsənin, «bu məzhəbin bütün hökmləri doğrudur, digərinki yalnış.» demək imkanı yoxdur. İşin doğrusunu Allah Taala bilir.

**5.1.2.** Zidd davranışlardan bir digəri də, bəzi kimsələrin bir məzhəbi digərindən üstün tutmasıdır. Hətta bu davranış, bəzilərini, məzhəb imamının üstünlüyünü dilə gətirən hədislər uydurmağa qədər götürmüşdür. Bununla bərabər, bəziləri də, müxalif məzhəbi və ya imamı alçaldan hədislər uydurmuşlardır!

Bütün bunlar, dərin cəhalətin və pislənmiş təəssübün məhsuludur. Bundan nə Allah Taala, nə də o məzhəblərin imamları razı olar! O imamlar ki, ixlas, təvazö və gözəl əxlaqda barmaqla göstərilən kimsələr idilər...

Bu davranışın, fərqli məzhəb müntəsibləri arasında yol açdığı düşmənlik və kini, münaqişə və iki üzlülüyü də, bu söylədiklərimizə əlavə etmək lazımdır.

## 5.2. Təfrit davranışlar:

**5.2.1.** Bəzi cahillərin, məzhəblər arasındakı elmi ixtilafı, Allah Taala'nın və Rəsulunun pislədiyi, failinin əzabla təhdid edildiyi «dində ayrılmaq, firqələrə, qruplara bölünmə» olaraq təqdim etməsi.

Onlar bu davranışlarına, dində ayrılmağı zəmm edən (pisləyən) və bunu edənlərə yönəlik təhdidlər ehtiva edən ayətləri dəlil göstərirlər.[1]

1 «Dinlərini parçalayıb firqə-firqə olanlarla sənin heç bir əlaqən yoxdur. Onların işi Allaha aiddir. Sonra Allah onlara etdikləri əməllər barədə xəbər verəcəkdir.» (Ənam/159)

Parçalanıb firqə-firqə olanlardan məqsəd kimlərdir?

İmam Qurtubi, «əl-Cami li ahkami'l-Quran»da, bu ayətin təfsirində bu

Halbuki onlar, bu etdiklərinin, «kəlimələrin yerlərini

görüşləri nəql edir:

Bu buyuruqla qəsd edilənlər, Mücahid, Qatadə, Süddi və Dahhaq'a görə:

•1• «Yəhudi və xristianlardır.»

Quran'da onlar, ayrılıq içərisində olmaqla vəsf edilmişlərdir. Uca Allah belə buyurur:

«Kitab verilənlər onlara yalnız aydın bir dəlil gəldikdən sonra firqələrə böləndülər.» (Bəyyinə/4)

«Allahı və Onun elçilərini inkar edənlər, Allahı Onun elçilərindən ayırmaq istəyib:

"Biz o elçilərin bəzisinə inanır, bəzilərinə isə inanmırıq!"– deyənlər və bunun arasında bir yol tutmaq istəyənlər, məhz onlar əsl kafirlərdir. Biz kafirlər üçün alçaldıcı bir əzab hazırlamışıq.» (Nisa/150-151)

•2• Bu buyuruqla, müşriklərin qəsd edildiyi də söylənilmişdir. Çünki onlardan bəziləri bütlərə, bəziləri də mələklərlə ibadət edirdilər.

•3• Ayətin bütün kafirlər haqqında ümumi olduğu da söylənmişdir.

•4• Uca Allah'ın əmr etməmiş olduğu hər bir şeyi uydurub bidət olaraq ortaya çıxaranlar da, dinlərini parçalamış olarlar.

Əbu Hureyrə, Allah Rəsulu dan belə rəvayət edir:

«Dinlərini parça-parça edib...» ayəti haqqında, bunların, bu ümmətdən olub bidət və şübhə əhli ilə dəlalət əhli kimsələr olduğunu bəyan etdiyini rəvayət etməkdədir. (Taberani, əl-əvsat, l, 384)

Baqiyyə b. Vəlid rəvayət edir:

Bizə Şu'bə b. əl-Haccac bildirdi, bizə Mücahid, əş-Şabi'dən bildirdi, o Şüreyh'dən, o, Ömər b. əl-Xattab'dan rəvayət etdiyinə görə, Allah Rəsulu, Aişəyə belə demişdir:

«Dinlərini parça-parça edib, özləri də firqə-firqə ayrılanlar, bu ümmətin bidət sahibləri, həva sahibləri və dəlalət sahibləridir.

Ey Aişə! Hər günah işləyənin bir tövbəsi vardır. Bidət sahiblərilə, həva sahibləri müstəsnadır. Onların tövbələri yoxdur. Mən onlardan uzağam, onlar da məndən uzaqdırlar.» (Heysəmi, Məcmau'z-Zəvaid, l, 188)

dəyişdirərək təhrif etmək» (Nisa/46) olduğunun fərqində deyillər.

Yenə bu davranış, bu ümmətin sələfindən xələfinə, Səhabə, Tabiun və onlara gözəlcə tabe olanlara yönəlik bir qaralama və yaralama mənası da daşımaqdadır. Çünki bütün o nəsillərin hamısı, -daha əvvəl gördüyümüz kimi- bir çox şəri əhkamda ixtilaf etmişlərdir.

### **5.2.2.** Mötəbər imamlardan birini təqlid edən müqəllidin, Kitab və sünnəti tərk edib, insanların görüşünə tabe olduğunun söylənməsi.

Bunu söyləyənlər, avama, təqlid etdiyi məzhəbin ictihadına zahirən zidd kimi görünən -misal üçün- dəlaləti zənni olan bir nass gətirərək, bu görüşlərini təyid edərlər (qüvvətləndirərlər).

Halbuki avam, nassı, gərəyi kimi anlaya bilmədiyi üçün, bir imamın məzhəbinə sarılmışdır!

Bu kimsələr, avamın bu davranışını şəri naslardan üz çevirmək olaraq təqdim, avamı da dinini, şəxsi görüşləri əsas alaraq yaşamaqla ittiham edərlər.

Halbuki insaflı düşünsələr, avamın, (nassın özündən deyil), o nasdan özlərinin çıxaracağı nəticədən üz çevirdiyini və bir imamın o nassı anlamaq tərzinə tabe olduğunu söyləməli idilər!

Dolayısı ilə, burda qarşı-qarşıya gələn, -onların təsəvvür etdiyi kimi- nasla bir insanın şəxsi görüşü deyil, eyni nassın 2 fərqli anlaşılma tərzidir!

### **5.2.3.** Bəzi kimsələrin, fiqhi məzhəbləri qaralama, yaralama və onları insanların gözündən salmaq cəhdləri.

Bunu bir neçə üslubla edirlər:

### **5.2.3.1.** Bəzi imamlara yönəlik qaralama və yaralama fəaliyyətləri.

Bunu etmək üçün, keçmişdə bəzi imamlar haqqında, bəzi alimlərdən -iç üzünü ancaq Allah Taala'nın bilə biləcəyi səbəblərlə- ortaya çıxmış pisləyici ifadələri, yenidən xortladarlar.

Bu tərz ifadələr, keçmişdə meydana gəlmiş, ancaq təhqiq əhli alimlər tərəfindən tərk edilmiş, torpağa basdırılmışdır. Çünki 4 imam və daha başqaları kimi, ədaləti yayılıb şöhrət qazanmış kimsələr haqqındakı qaralayıcı və yaralayıcı ifadələrin qəbul edilməyəcəyi, üzərində ittifaq edilmiş xüsuslardandır.

### **5.2.3.2.** Müxtəlif məzhəblərdəki elmi xətaları və zəif görüşləri bir araya toplamaq səyləri:

Bəzi kimsələr sonrakı dövrlərdə qələmə alınmış bəzi fiqh kitablarını incləyib, hər hansı bir imamı qaralamaq və ya anlayışını və elmini zəif düşürtdüyü görüşləri toplayıb elmi məclislərdə gündəmə gətirir, bu məsələləri mövzu edən kitablar yazır, bu surətlə insanların məzhəblərinə olan inamını sarsmağın və ya onları öz görüş və sözlərinə tabe qılmanın hesabını aparırlar.

Şübhə yoxdur ki, bu tərz işlər, pislənmiş, çirkin görülmüş, şəriətin və ağlın qəbul etməyəcəyi şeylərdir.

İmamlar insandırlar, xəta da edərlər, isabət də. Onların bəzi mövzulardakı istidlalları zəif görülmüşdür, bu doğrudur. Ancaq onlardan heç birisi məsumluq iddia etməmişdir. Hər necə olursa olsun, ictihadlarında əcr qazanmış olmaları onlara kifayət edər!

O halda, onların xətalarının arxasına düşənlər, ancaq

qısqanc və həsəd edici yaxud amansız düşmənlik hislərilə dolu, nəfslərdə yer etmiş olan bu böyük binanı yıxmağı, fiqh və fəqihlərə duyulan inamı sarsmağı özlərinə məqsəd etmiş kimsələrdir...

Daha əvvəl- bu kitabın müqəddiməsində- alimlərin bu tərz davranış və məqsədlərə diqqət çəkən və onlardan çəkindirən fərasət dolu təsbitlərini görmüşdük.

**5.2.4.** Bəzi kimsələrin, şöhrət hissilə alimlərin görüşlərini pisləməsi, gözdən düşürtməyə çalışması, dəlillərini əskik və nöqsən bir şəkildə təqdim edərək yerə sərdiyi o görüşlərin yıxılmağına, öz görüşünün və açıq-aydın haqq olan və xətalı olma ehtimalı olmayan (!) öz məzhəbinin bayrağını asmağa çalışması.

Belə kimsələr, başqalarını yıxmaq üzərində qurulmaqdan başqa bir şey etməyə qüdrəti olmayanlardır. Bu elmlərilə əslində sadəcə öz cəhalət və zəifliklərini ortaya qoymuş olurlar. Yoxsa belə bir yolu tərcih etməz, digərlərinin görüşlərinə hörmət göstərməyi də nəzərdən qaçırmadan, öz görüş və anlayışını ortaya qoymaqla kifayətlənər, insanların bu görüş haqqında bəhs etmələrinə, öz görüşünü də, digərlərinin görüşünü də dəyərləndirməsinə fürsət tanıyardı...

Alimlərin neçə-neçə görüşləri vardır ki, insanlara açılmış və- mötəməd məzhəblər və fərqli görüşlər varkən- özlərindən sonra gələn mühəqqiq alimlər tərəfindən gözəl görülmüşdür.

## Xəbərdarlıq:

Burda haqqında danışdığımız zidd davranış sahibləri, bəzi zamanlar, bir qisim insanlarda gördükləri ifrat və ya təfrit davranışlara həll gətirmək üçün belə bir yol izlədiklərini irəli sürürlər. Sanki ifratın dərmanı təfritmiş kimi və sanki təəssüb

ancaq cəhalətlə müalicə edilirmiş kimi!

Bunlar bilməlidirlər ki, ifrat olsun, təfrit olsun, bu deffekt davranışların tək müalicəsi, problemə, doğru yaxınlaşmaq surətilə olacaqdır. Belə ki:

Hal onlara gərəyi kimi izah ediləcək, bu ixtilafların həqiqəti, qaynağı və səbəbləri açıqlanacaq və sələfin mövzu haqqındakı davranışı göstəriləcək...

Bunu edərkən, düşmənlərin onların davranışlarına hazır etdiyi zəmindən ta quruluşuna qədər necə sızdığına və bir çox hədəflərinə bu surətlə çatdığına da diqqət çəkiləcək...

Düşmənlərimizin, ixtilafları alovlandırmaqdan və səflərimizi parçalamaqdan daha böyük nə hədəfi ola bilər? Dolayısı ilə ixlas sahibləri, bu hədəflər mövzusunda oyaq olmalı, bu deffektlərin müalicəsində hikmətlə hərəkət etməlidirlər. Əks halda, əvvəldən bəri söylənən bu söz, bir daha yerini tapmış olacaqdır:

«Ağıllı düşmən, cahil dostdan yaxşıdır.»

## Əlavə

## Fiqhi ixtilaflar mövzusunda qələmə alınmış dəyərli əsərlər

İxtilaflı elmi görüşlərin gərək əhəmiyyəti -necə ki, biz bunu ixtilafların qaynağı bəhsində görmüşdük- gərəksə ilk dövrlərə dayanması səbəbilə, bu mövzunu ələ alan bir xeyli elmi əsər yazılmışdır. Mövzunun ələ alınış tərzində də, alimlər müxtəlif metodlar izləmişlərdir. Dəlilləri incələyən, əhkam istinbat edən və fətva vermək halında olan kimsələrin bu əsərləri tanıması və onlardan xəbərdar olması gərəkdiyi mövzusunda ittifaq edilmişdir.

İmam Əhməd b. Hənbəl’in bu sözünü daha əvvəl görmüşdük:

«Bir kimsənin, şəri fətvalar sahəsində alimlərin görüşlərini, məzhəblərini bilmədən fətva verməsi uyğun deyildir...» [1][2]

Bu səbəblə ibn əbi Şeybə'nin və Abdu'r-Rəzzaq'ın «əl-Musannəf»ləri, imam Malikin «əl-Muvatta»sı və daha başqa elmi əsərlər, alimlərin görüş və ictihadları ilə doludur.

Hədis şarihləri də, sünnət qaynaqlarını şərh edərkən, onları zikr etmişlərdir.

- İbn Həcər'in 'Fəthu'l-Bari'si,
- Nəvəvi'nin «Şərh-u Muslim»i,
- «Sunən-i ərbaa» və «Müsnəd»lərin şərhləri belədir.

Yenə onları əvvəlki dövrlərdə və yeni zamanlarda qələmə alınmış ümumi fiqh kitablarında da tapa bilərik.

- İbn Hazm'ın «əl-Muhalla»sı;
- ibn Qudamə'nin «əl-Muğni»si;
- Cəziri'nin «əl-Fiqh alə'l-Məzahibi'l-Ərbaa»sı

bu tərz əsərlər arasındadır.

Eyni şəkildə o görüş və ictihadları, ümumi məqsədli təfsir kitablarında, xüsusi ilə də, Əhkam Təfsiri tərzindəki əsərlərdə görürük. Qurtubi'nin təfsiri və «Əhkamu'l-Quran» adı ilə qələmə alınmış əsərlər belədir.

Fərqli kitablarda və fərqli tərzlərdəki əsərlərdə yayğın olaraq yer almaqla birlikdə, alimlərin görüş və ictihadları mövzusunda alimlər özəl əsərlər də qələmə almışlardır.

1 *Dihləvi, «əl-İnsaf», s. 63*

2 Bənzəri bir sözü ibnu'l-Qayyim də, yenə imam Əhməd'dən belə nəql etmişdir:
«Fətva verən kimsənin, əvvəlkilərin görüşlərini bilməsi gərəkdir. Əks halda fətva verməməlidir.» (bax: «İlamu'l-Muvaqqiin», I, 45, təhqiq: Muhyiddin Əbdulhəmid

Bu tərz «mövzuya özəl» kitabları 2 qrupda ələ almaq mümkündür:

1. Bir tək məsələdə varid olmuş fərqli görüşləri bir araya toplayan əsərlər. Bunların bəzilərində dəlillərə də yer verilərkən, digərlərində dəlil zikr edilməz.

2. İxtilafları, qaynağı və səbəbləri cəhətindən ələ alan əsərlər. Bizim də bu çalışmamızda etməyə çalışdığımız şey budur.

Bu 2 qrupa girən əsərlərə nümunə olaraq bunları zikr edə bilərik:

## Birinci qrup:

## Fərqli məsələlərdəki ixtilaflı görüşləri bir araya toplayan əsərlər.

Bu qrupa girən əsərlərin qələmə alınma tarixi erkən ictihad vaxtlarına qədər uzanır. Bu mövzuda ilk əsər yazanlardan birinin

• imam Malik olduğunu söyləyənlər vardır. O, «əl-Muvatta» adlı əsərini yazmış və bu əsərində, özündən əvvəlki alimlərin ixtilaflarına yer vermişdir.

• İmam Əvzai, «Siyər-u əbi Hənifə»yə rəddiyyə olaraq bir kitab qələmə almışdır. Bunun üzərinə:

• imam əbu Yusuf da ona rəddiyyə mahiyyətində «ər-Rədd alə Siyəri'l-Əvzai» adı ilə bilinən əsərini yazmışdır.

• imam Muhamməd b. əl-Həsən də, «Siyəru'l-Kəbir» və İraq fəqihləri ilə Mədinə fəqihləri arasındakı ixtilafları zikr etdiyi «əl-Hucəcu'l-Mubəyyənə» adlı əsərini yazmışdır. («əl-Huccə alə Əhli'l-Mədinə» adı ilə bir qismi nəşr edilmiş olan əsər qəsd edilməktədir.)

• imam Şafi'nin «Kitabu'l-Umm»u, bu əsərlə birlikdə nəşr edilən «İxtilafu'l-Fuqaha»dan bir çox bəhs ehtiva etməktədir.

• ibnu'n-Nədim'in «əl-Fihrist»də zikr etdiyi kimi, Əhməd b. Nasr əl-Mərvəzi, «İxtilafu'l-Fuqaha əl-Kəbir» və «İxtilafu'l-Fuqaha əs-Sağir» adlı əsərləri qələmə almışdır.

• əbu Yəhya Zəkəriyyə əs-Saci, «əl-İxtilaf fi'l-Fiqh» adlı bir əsər yazmışdır.

• Davudilərin övladlarından əbu İshaq İbrahim b. Cabir'in «əl-İxtilaf» adlı əsəri, bu mövzular haqqında qələmə alınmış ən geniş həcmli əsərdir.

Fəqihlərin ixtilafları mövzusunda qələmə alınmış məşhur kitablardan bir digəri də:

• imam əbu Cəfər Muhamməd b. Cərir ət-Təbəri'nin, Alman Fridrix Kern tərəfindən bəzi parçaları nəşr edilən: «İxtilafu'l-Fuqaha»sıdır.

Bu əsərin bir neçə parçasını da, Doktor Cozef Şaxt, 1933-cü ildə nəşr etmişdir.

Bu sahədəki bir digər əsər də:

• imam əbu Cəfər Tahavi (əl-Hənəfi)'nin: «İxtilafu'l-Fuqaha»sıdır.

Əbu Bəkr b. Muhamməd b. İbrahim b. əl-Munzir əş-Şafi'nin «əl-İşraf alə məzahibi əhli'l-ilm» əsəri;

• imam Quduri (əl-Hənəfi)'nin «ət-Təcrid»i;

• imam Beyhaqi (əş-Şafi)'nin «əl-Xilafiyyat»ı;

• İbn Cəmaa (əş-Şafi)'nin «əl-Vəsəil fi furuqi'l-Məsəil»i;

• əl-Abdəri (əş-Şafi)'nin «Muxtasaru'l-Kifayə»si;

• əbu Bəkr Muhamməd b. Əhməd əş-Şaşi (əş-Şafi)'nin

«Hilyətu'l-Uləma fi ixtilafi'l-fuqaha»sı;

• Radiyuddin əs-Səraxsi (əl-Hənəfi)'nin «ət-Tariqatu'r-Radaviyə»si;

• Alauddin əs-Səmərqandi (əl-Hənəfi)'nin «Muxtəlifu'l-Rivayə»si;

• əd-Dahhan (əş-Şafi)'nin «Təqvimu'n-Nazar»ı;

• əbu Hənifə Numan b. Muhamməd əl-Məğribi əş-Şi'i'nin «İxtilafu'l-Fuqaha»sı.

## Nəticə

Buraya qədər söylədiklərimizdən anlaşılmış olmaqdadır ki, fəqihlərin ixtilafı, geniş və dəqiq bir mövzudur. Əvvəldən bəri bu mövzuda əsər yazanlar, məsələni fərqli metodlarla ələ almışlardır. İxtilaf səbəblərini müfəssəl olaraq zikr edənlər olduğu kimi, toplu şəkildə zikr edib keçənlər də vardır. Yenə onlar arasında, müxtəlif görüşləri bir araya toplayanlar və bir biri ilə qarşılaşdıranlar da vardır.

Bu səbəblə, mən, bu əsərimdə fəqihlərin ixtilafları -ən əhəmiyyətli nöqtələr olaraq gördüyüm- bir neçə əsasını ortaya qoymaqla kifayətləndim. Çünki hər Müsəlman, fiqhi ixtilafların təbiətini, qaynağını və səbəblərini qavradıqdan sonra, mövzu haqqında sağlam bir davranış göstərə bilmək üçün, bunları bilməyə ehtiyac duyar. Əlavə olaraq, bir də, fiqhi ixtilaflar mövzusundakı sağlam davranışla zidd davranışlar mövzusunda xəbərdarlıqlar etdim.

Mövzuları işləyərkən, bu günlərdə bir çox insana gizli qalmış bəzi həqiqətləri açıqlamış olduğumu umuram. Bu həqiqətlərdən xəbərsiz olanlar, eşitdikləri ixtilaflar səbəbilə təəccüb və tərəddüddə qalmaqda, bu surətlə şübhələr gedərək yayğınlaşmaqdadır. Halbuki, bu məsələlərdə tərəddüd və şübhə içində qalmaq, caiz deyildir...

Bizim həqiqətini bilməyə şiddətlə ehtiyac duyduğumuz bu məsələni, bu ümmətin sələfi, kamil bir anlayışla qavramış, bu səbəblə də, o dövrlərdə bu mövzu haqqında əsər yazmağa ehtiyac olmamışdır.

Aradan zaman keçdikcə və insanlar elmin ilk qaynaqlarından uzaqlaşmağa başladıqca, bu ixtilaflar qarşısında dözümsüzlüklər görülməyə, niyə ortaya çıxdıqları və həqiqətləri mövzusunda təəccüblər yaşanmağa başlanmış, bu mövzuya necə baxmaq lazım gəldiyi nöqtəsində tərəddüdlər baş göstərmişdir.

İslam düşmənləri belə hallarda Müsəlmanların şüuruna zəhərlərini axıtmaq və Müsəlmanları fiqh və fəqihlərdən soyutmaq üçün əlverişli dəliklər tapmışlardır. Bu nöqtədə bəzi müsəlmanlardan meydana gələn ifrat və təfrit davranışlar da, onlara bu əməllərini reallaşdırmaqda kömək etmişdir. Yenə onlar, hər cəmiyyətdə görülən ixtilafları və təcdid ruhunu da istismar etməkdən geri durmamışlardır. Bütün bunların nəticəsi olaraq, İslam düşmənləri, bir qisim əməllərinə çatmış, bir qisim məqsədlərini  də gerçəkləşdirmişlərdir.

Allah Taala bu ümmətə böyük alimlər nəsib etmiş və onlar, düşmənlərinin əməlləri mövzusunda ümmətə xəbərdarlıqlar etmiş, sələflərinin doğru hərəkət tərzlərini göstərmiş və ixtilaflarının səbəblərini açıqlamışlardır.

Bizim bu nöqtələrin aydınladılmasına və gözəlcə açıqlanmasına şiddətlə ehtiyac duymağımız, təəccüblü deyildir. Çünki günümüzdə insanların halındakı pozulma, elmdəki zəiflik və alimlərin sayısındakı azalma və özünü adam sinfində görənlərin sayısındakı artım, xalqdakı dərin qəflətə qarşılıq, düşmənlərin oyaq olması, hər kəsin məlumudur.

Bu risalə ilə, düşmənlərimizin əvvəldən bəri, məqsədlərini reallaşdırmaq və içimizə sızmaq üçün tapdıqları dəliklərin örtülməsi nöqtəsində, alimlərlə şərik olduğumuzu umuruq. Yenə umuruq ki, nəfislərdə yox olmağa üz tutmuş dini

həqiqətlər və mənası tərsinə çevrilmiş məfhumlar və həqiqətlər mövzusunda, haqqında danışdığımız bəsit kimsələrin, həqiqəti görməsinə köməklik göstərə bildik.

Allah Taala'nın bizim və ümumilikdə bütün müsəlmanların əlindən tutmasını və bizi bizim üçün xeyir və izzət mövcud olan nöqtəyə yönləndirməsini, dinimizi qorumasını, başımızdan, əməl edən, saleh, ixlaslı, şüurumuzdakı boşluqları dolduran, həyatımızdakı dəlikləri örtən, düşmənləri kontrol altında tutan alimləri əskik etməməsini niyaz edirik. Bu surətlə, əslsiz iddialarda olanlar azalacaq, qafillər qəflət yuxusundan oyanacaqdırlar...